"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"




## Pedaqoji Universitetdə kadr potensialı gəncləşdirilir - statistika

PEDAQOJİ UNİVERSİTETDƏ KADR POTENSİALI GƏNCLƏŞDİRİLİR - STATİSTİKA




Son 7 il ərzində (2016-2023) ADPU-da tədris və tədqiqat keyfiyyətinin artırılması, eləcə də infrastrukturun yenilənməsi istiqamətində görülən tədbirlərlə yanaşı istedadlı gənc mütəxəssislərin universitetə cəlb olunması, kadr potensialının müntəzəm olaraq gəncləşdirilməsi sahəsində də sistemli iş aparılır.

Qeyd edək ki, hazırda ADPU-da çalışan 1422 nəfər əməkdaşın 49 faizi 2016-cı ildən sonra işə götürülənlərdir. Ümumilikdə, ADPU-da 747 nəfər professor-müəllim heyəti, 239 nəfər tədris-köməkçi heyət və 296 nəfər idarəetmə və inzibati aparat əməkdaşı fəaliyyət göstərir. Onlardan həm professor-müəllim heyəti, həm tədris-köməkçi heyət, həm də idarə və inzibati aparatda çalışanlar arasında son 7 ildə 30 yaşadək və 31-40 yaş aralığında artım dinamikası müşahidə olunur. 40-60 aralığında yaş qrupuna daxil olan, eləcə də, 60 yaşdan yuxarı əməkdaşların xüsusi çəkisi isə azalmağa doğru gedir.

Son 7 ildə Pedaqoji Universitet əməkdaşlarının yaş dinamikasının dəyişməsi ilə qrafiklərdən tanış ola bilərsiniz

## ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsi ilin ilk 6 ayında 22 mindən çox müraciəti cavablandırıb

Pedaqoji Universitetdə ictimaiyyətlə əlaqələr sahəsində işin təkmilləşdirilməsi daim diqqət mərkəzində saxlanılır. İctimaiyyətlə əlaqələr və marketinq şöbəsi tərəfindən ADPU-nun rəsmi saytı, sosial media səhifələri və digər kommunikasiya kanalları vasitəsi ilə mütəmadi olaraq Pedaqoji Universitetdə baş verən yeniliklər aparıcı KİV-lər, telekanallar, habelə, elektorn və çap mediasında işıqlandırılır, ADPU-nun mətbu orqanı olan "Gənc müəllim" qəzeti çap və elektron qaydada dərc olunaraq yayımı həyata keçirilir.

Ötən dövrlərdə olduğu kimi 2024-cü ilin ilk 6 ayı ərzində də rəsmi informasiya yayımı ilə yanaşı, KİV, ictimaiyyət və tələbələrdən daxil olan minlərlə sual və sorğular operativ qaydada cavablandırılıb, zəruri hallarda müvafiq açıqlama və müsahibələr verilib, universitet əməkdaşları və tələbələrinin dövri mətbuatda və televiziyalarda ictimai müzakirələrdə iştirak etmələrinə dəstək göstərilib, "ADPU TV" yutub televiziyasında yeni veriliş və rubrikalar hazırlanaraq yayımlanıb.

Onu da qeyd etmək lazımdır ki, Universitetin marketinq siyasətinin həyata keçirilməsində fərqlənən məsul şəxslər və tələbələr üçün mütəmadi olaraq rəğbətləndirmə tədbirləri həyata keçirilir.

2024-cü ilin ilk 6 ayının yekunlarına əsasən şöbə tərəfindən Pedaqoji Universitetdə baş verən mühüm yeniliklər və tədbirlərlə bağlı yayımlanan 371 xəbər 2017 mənbədə işıqlandırılıb ki, bu da ötən ilin analoji dövrü ilə müqayisədə müvafiq olaraq yayımlanan xəbər sayında təxminən 11% və xəbərlərin işıqlandırıldığı mənbə sayında isə 9,5% artım deməkdir. Hesabat dövründə ADPU-nun sosial media hesablarının fəaliyyətinin analizinə əsasən son 6 ayda rəsmi "Instagram" səhifəsində 2 milyondan çox (ötən ilin analoji dövrünə nisbətən təxminən 20% artım), rəsmi "Facebook" səhifəsində 2 milyonadək (ötən ilin analoji dövrünə nisbətən təxminən 18% artım), rəsmi "Telegram" kanalında 1,8 milyona qədər (ötən ilin analoji dövrünə nisbətən təxminən 15% artım), "ADPU TV" rəsmi "Youtube" kanalında isə 170 mindən çox (ötən ilin analoji dövrünə nisbətən təxminən 9% artım) oxunma və baxış qeydə alınıb.

İlin ilk 6 ayında İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinə daxil olan vətəndaş müraciətlərinin sayında ötən ilin müvafiq dövrünə nisbətən təxminən 20% artım müşahidə olunub.



Ümumilikdə bu dövr ərzində şöbə tərəfindən 22 mindən çox tələbə və vətəndaş müraciətinə baxılıb. Bütün bunlarla yanaşı, şöbə sosial korporativ məsuliyyət prinsiplərini əsas tutaraq ali təhsil müəssisələri arasında ilk dəfə olaraq tələbələrin inkişafına dəstək vermək və ADPU-nun gələcək kadr bankını formalaşdırmaq məqsədi ilə "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinə start verib. Cari ilin fevral-may aylarında keçirilən I müsabiqəyə tələbələr böyük maraq göstərib, müsabiqə uğurla yekunlaşaraq qalib olan 20 tələbə ADPU və sponsorlar tərəfindən mükafatlandırılıb, onlar üçün bir il ərzində davam edəcək mentorluq proqramının hazırlanmasına başlanılıb.

Qeyd edək ki, müsabiqənin növbəti illərdə də müntəzəm olaraq keçirilməsi planlaşdırılır. Ümumən qeyd etmək lazımdır ki, Pedaqoji Universitetin ictimaiyyətlə əlaqələrini daha da təkmilləşdirmək, əlçatanlılıq və şəffaflığı, ictimai hesabatlılığı təmin etmək məqsədi ilə şöbə tərəfindən sistemli fəaliyyət icra olunur.

## Pedaqoji Universitetdən 4700-dən çox tələbə məzun olur




Bu il Pedaqoji Universitetdən filiallar və Pedaqoji Kolleclə birgə ümumilikdə 4700 nəfərdən çox tələbənin məzun olması nəzərdə tutulur. Sevindirici haldır ki, ADPU-nun bakalavr səviyyəsi üzrə cari il məzunlarının 812 nəfəri (34 %) magistraturaya qəbul imtahanlarından uğurla keçərək ixtisas seçimi mərhələsində iştirak etmək hüququ qazanıblar. Eyni zamanda, bu günədək ADPU-nun 54 nəfər sonuncu tədris ili tələbəsi xarici ölkələrin ali təhsil müəssisələrinin magistraturalarına sənəd təqdim ediblər (sayın artacağı proqnozlaşdırılır). Həmçinin bu il məzun olanlardan 34 nəfər SABAH magistratura, 44 nəfər SABAH bakalavr, 42 nəfər isə ADPU-nun ABŞ-nin Corc Vaşinqton Universiteti ilə birgə magistr ikili diplom proqramının məzunlarıdır.

1921-ci ildən təhsilimizin keşiyində . . .

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | İyun 2024 / № 2 (1127)

## ADPU məzunlarının dövlət qulluğu imtahanlarındakı nəticələrinə görə IV yerdədir




2023-cü il ərzində Dövlət İmtahan Mərkəzi dövlət qulluğunun inzibati vəzifələrinin tutulması məqsədilə A və B növləri üzrə hər biri 6 imtahan olmaqla, ümumilikdə 12 test imtahanı keçirib. İmtahanlarda iştirak edən 16200 namizəddən 4709 nəfəri uğurlu nəticə əldə edib.

Test imtahanlarında uğur əldə edərək sertifikat alan namizədlərin təhsil aldığı ali məktəblər üzrə nəticələrə əsasən, ADPU IV yerdə qərarlaşıb.

Test imtahanlarında uğur qazanan 4709 nəfərdən 256-sı ADPU-nun məzunudur.

## Qubada akademik Zərifə Əliyevaya həsr olunmuş tədbir: Zəriflik




Pedaqoji Universitetin (ADPU) Quba filialı və Quba Tibb Kollecinin birgə təşkilatçılığı ilə görkəmli oftalmoloq-alim, akademik Zərifə Əliyevanın anadan olmasının 101-ci ildönümünə həsr edilmiş "Zəriflik" adlı tədbir keçirilib.

Quba Tibb Kollecində keçirilən tədbirdə, əvvəlcə, filialın direktoru, dosent Yusif Alıyev geniş məruzə ilə çıxış edərək qeyd edib ki, Azərbaycan Respublikasının Əməkdar elm xadimi, tibb elmləri doktoru, akademik Zərifə Əziz qızı Əliyeva Azərbaycan oftalmologiyasını dünya səviyyəsində tanıdıb. Bildirilib ki, akademik Zərifə Əliyeva elmi-pedaqoji fəaliyyətində təkcə çoxşaxəli elmi-tədqiqat işləri aparmaqla kifayətlənməmiş, yüksəkixtisaslı gənc alim kadrlarının yetişdirilməsinə və oftalmoloq-həkimlərin ixtisaslarının artırılması işinə də xüsusi diqqət yetirmişdir. Zərifə Əliyeva, eyni zamanda müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, bütün mənalı ömrünü vətəninin və xalqının tərəqqisinə həsr etmiş dahi şəxsiyyətin - Ümummilli Lider Heydər Əliyevin vəfalı ömür-gün yoldaşı, sədaqətli dostu və etibarlı silahdaşı olmuşdur. Onun formalaşdırdığı ailə institutu Azərbaycana Ali Baş Komandan İlham Əliyev kimi öz yolu və strategiyası olan əvəzsiz lider bəxş etmişdir.

Daha sonra Quba Tibb Kollecinin direktoru, həkim Mikayıl Mirzəliyev, filialın Humanitar elmlər kafedrasının müəllimi Elza Orucova, Heydər Əliyev lektoriyasının müdiri Nəhayət Şirinova, eləcə də filialın və kollecin tələbələri mövzu ətrafında çıxışlar etmiş, şeir və musiqilər səsləndirmişlər.

## ADPU-da Elmi Şuranın iclası: reytinq qiymətləndirilməsinin nəticələri təqdim olundu





Aprelin 25-də Universitet (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib. Əvvəlcə, Elmi Şuranın sədri, ADPU-nun rektoru, professor Cəfər Cəfərov professor Mahirə Hüseynovaya Dünya Söz Akademiyasının fəxri akademik üzvlüyü diplomunu və Xuraman Səfərova, Səbinə Hacıyeva və Şəfa Məmmədovaya dosent attestatlarını təqdim edib.

Şuranın iclasında Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov "ADPU-da professor-müəllim heyətinin 2023-cü ildə fəaliyyətinin Reytinq qiymətləndirməsinin hesabatı"nı təqdim edib. Hesabatda qeyd olunub ki, 2023-cü ildə qiymətləndirmədə, ümumilikdə 1271 nəfər iştirak edib. Qiymətləndirmənin nəticələrinə görə, həm ADPU, həm filiallar, həm də Pedaqoji Kollec üzrə professor-müəllim heyətinin orta ballarında artım müşahidə olunur. Əgər ötən ilin qiymətləndirməsinə əsasən, ən çox bal aralığı 30-500 arasında dəyişirdisə, cari ildə bu dinamika 200-500 aralığında özünü göstərir. Bu tendensiya fakültələrdə 300-1500, filiallarda 200-700, ADPK üzrə isə 200-500 bal aralığında təzahür edir. ADPU üzrə tələbələr müəllimlərin 60 faizə qədərini 85-100 bal, 35 faizə qədərini isə 65-85 bal aralığında qiymətləndirir. Reytinq qiymətləndirilməsinə cəlb olunan 1271 müəllimdən 1071-nin il ərzində müxtəlif yerli və xarici nəşrlərdə 2166 elmi əsərləri dərc olunub ki, bu əsərlərin 9 faizə qədəri "Web of Science" və "Scopus", 23 faizə qədəri digər beynəlxalq bazalarda indekslənən, 36 faizə qədəri isə AAK tərəfindən tövsiyə olunan jurnallarda nəşr olunub.

Şöbə müdiri sonda Keyfiyyət Komissiyasının təhlilləri əsasında il ərzində "Web of Science" və "Scopus" bazalarına daxil olan jurnallarda məqalələri dərc olunan müəllimlərə əlavə pul mükafatının da təyin olunmasını təklif edib.

Sonra Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli şöbənin illik hesabatını təqdim edib. Vurğulanıb ki, şöbə tərəfindən ADPU-da fəaliyyət göstərən bütün strukturlar və tələbə təşkilatları, maraq klubları ilə birgə tələbələrin asudə vaxtlarının səmərəli təşkili məqsədi ilə sistemlişdirilmiş iş aparılır. Belə ki, planlama və əlçatanlığı təmin etmək məqsədi ilə şöbə "Microsoft To Do" və "Planner" proqramları, eləcə də onlayn təqvim vasitəsi ilə tədbirləri koordinasiya edir.

T.Kərimli diqqətə çatdırıb ki, il ərzində şöbə tərəfindən tədris və imtahan proseslərinin təşkili, universitet xidmətlərindən məmnunluqla bağlı, eləcə də yeni qəbul olunan tələbələr və məzunların fikir və təkliflərini öyrənməklə bağlı 5 sorğu təşkil olunub. Eləcə də, Pedaqoji Universitetin tələbə təşkilatları tərəfindən il ərzində 911 fəaliyyət icra olunub ki, bunların 841-i ənənəvi, 70-i onlayn formatda olub.

Sonda təklif olunub ki, professor-müəllim heyətinin reytinq qiymətləndirilməsində "Tələbələrin ictimai fəaliyyətinə dəstək" bölməsi də nəzərə alınsın. Daha sonra elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov "Azərbaycanda ətraf mühitin sağlamlaşdırılmasında Ümummilli Lider Heydər Əliyevin rolu" adlı elmi-praktik konfransın keçirilməsi, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov ADPU 2030 "Strateji İnkişaf Planı"nın layihəsinin müzakirəyə çıxarılması, rektorun müşaviri Ümid Mehdiyev yeni fəaliyyət planının icrası, Tədris departamentinin direktoru dosent Sənan Əliyev isə "ADPU-da tələbəyə ailə vəziyyətinə görə akademik məzuniyyətin verilməsi qaydası"nın təsdiqi və tədris-metodiki vəsaitlərin nəşrinə icazə verilməsi barədə məruzə ediblər.

Təqdim olunan hesabatlar və məruzələr ətrafında müzakirələr aparılıb və hesabatlar qəbul edilib, müvafiq məsələlər haqqında müsbət qərarlar qəbul olunub.

## Rektor "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin yarımfinalçıları ilə görüşüb

Aprelin 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin yarımfinalçıları ilə görüşüb. Görüşdə, həmçinin tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev və layihə rəhbəri Cavid Hüseynov da iştirak edib.

Müsabiqənin yarımfinalçıları ilə görüşdə çıxış edən rektor, prof. C.Cəfərov Pedaqoji Universitetin təhsil idarəçiliyi sahəsində innovativ və yenilikçi təcrübə və təşəbbüslərə açıq olduğunu və ali məktəblər arasında ilk dəfə ADPU-da təşkil olunan bu formatda müsabiqənin də bu məqsədə xidmət edən, istedadlı tələbələrin potensiallarının aşkarlanması və onların kadr bankına əlavə olunmaları, mentorluq proqramına cəlb olunaraq inkişaflarına dəstək göstərilməsi məqsədi daşıdığını diqqətə çatdırıb.

Daha sonra yarımfinalçılar öz təəssüratlarını bölüşərək göstərilən yüksək diqqətə və yaradılan şəraitə görə minnətdarlıqlarını bildirib, onları maraqlandıran sualları səsləndiriblər.

Görüşdən sonra isə müsabiqənin proqramına uyğun olaraq, yarımfinalçılar üçün növbəti təlimlər təşkil olunub. Təlimçi Fəxrəddin Abdullayev "Liderlik və natiqlik", təlimçi, "Yüksəliş" müsabiqəsinin finalçısı (2021 və 2023), universitetin redaktoru





Taleh Mirzəyev isə "Situasiyaya uyğun davranış və hadisələrin düzgün təhlili" mövzularında təlimlər keçiblər. Təlimlərdə kollektiv müzakirələrdə liderlik və situasiyanın düzgün idarə edilməsi kimi mövzulara toxunulub.

## ADPU-da intellektual yarış: Həmrəy olaq, bir olaq, bu dünyanı qoruyaq



Aprelin 26-da Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsi və 2 nömrəli Uşaq-Gənclər İnkişaf Mərkəzinin təşkilatçılığı ilə mərkəzin Məntiqi riyaziyyat dərnəyinin üzvləri arasında "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş "Həmrəy olaq, bir olaq, bu dünyanı qoruyaq" adlı intellektual yarış keçirilib. Yarışın keçirilməsində məqsəd şagirdlərdə yaşıl dünya üçün həmrəylik təfəkkürünün inkişafına dəstək vermək, ölkəmizdə baş tutacaq COP29 konfransı barədə məlumat vermək və məktəbli-universitet əlaqələrini inkişaf etdirməkdir. Yarışdan öncə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev şagirdlərlə görüşüb, universitet haqqında onlara məlumat verib. Yarışda münsiflər heyəti kimi Riyaziyyat fakültəsinin 4 müəllimi iştirak edib. İntellektual yarışda, ümumilikdə, dərnəyin 44 şagirdi, 7 komanda şəklində yarışıblar. Sonda iştirakçı şagirdlər təşəkkürnamə, I, II və III yerə sahib olan komandaların üzvləri isə diplomla təltif olunub.

## "Azərbaycanda ətraf mühitin sağlamlaşdırılmasında Ümummilli Lider Heydər Əliyevin rolu" – konfrans



Şamaxı Rayon İcra Hakimiyyəti, N.Tusi adına Şamaxı Astrofizika Rəsədxanası, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və Şamaxı filialının birgə təşkilatçılığı ilə rəsədxanada "Azərbaycanda ətraf mühitin sağlamlaşdırılmasında Ümummilli Lider Heydər Əliyevin rolu" mövzusunda elmi-praktik konfrans keçirilib.

Əvvəlcə Heydər Əliyev adına parkda Ulu Öndərin abidəsi önünə gül dəstələri düzülüb, əziz xatirəsi ehtiramla yad olunub. "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində təşkil edilən konfransda Şamaxı Rayon İcra Hakimiyyətinin başçısı Tahir Məmmədov, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, universitetin beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, Şamaxı filialının direktoru, dosent Tünzalə Yusifova dünyanı narahat edən ekoloji problemlərdən, iqlim dəyişikliklərindən, onların canlı aləmə mənfi təsirlərindən danışıblar. Çıxış edənlər ölkəmizdə ekologiyanın, ətraf mühitin qorunmasına xüsusi önəm verildiyini vurğulayıb, əsası Ümummilli Lider Heydər Əliyev tərəfindən qoyulmuş, Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilən ekoloji siyasət haqqında məlumat veriblər.

"Qlobal iqlim dəyişikliyinin elmi aspektləri" mövzusunda geniş məruzə ilə çıxış edən N.Tusi adına Şamaxı Astrofizika Rəsədxanasının baş direktoru Namiq Cəlilov ölkəmizdə aparılan ekoloji siyasət strategiyasının ümumi konturları və prinsiplərini şərh edib. Qeyd olunub ki, müasir çağırışlara uyğun şəkildə həyata keçirilən ekoloji siyasətimiz ekoloji tarazlığın bərpasına, ekologiyanın qorunmasına hesablanmış kompleks fəaliyyəti özündə əks etdirir. Tədbirin sonunda Namiq Cəlilova ADPU-nun 100 illik "yubiley" medalı təqdim edilib.

## ADPU-nun rektoru Şamaxı filialının kollektivi ilə görüşüb



ADPU-nun rektoru, professor Cəfər Cəfərov Şamaxı filialının kollektivi ilə görüşüb. Rektor rəhbərlik və professor-müəllim heyəti ilə söhbət edib, auditoriyalarda olaraq tələbələrin bilik səviyyələri ilə maraqlanıb. O, həmçinin kollektivin təklif və iradlarını dinləyib.

Görüş zamanı həm də Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayevin müvafiq əmrinə əsasən "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunmuş bir qrup əməkdaşa medallar təqdim olunub.

Belə ki, filialın direktoru, dosent Tünzalə Yusifova, Pedaqoji fakültənin dekanı Qahirə Şahbazova, Dil-ədəbiyyat və onların tədrisi texnologiyası kafedrasının müdiri, f.ü.f.d Eyvaz Eminaliyev, Riyaziyyat və kompüter elmləri kafedrasının müdiri Firidə Mustafayeva, kafedranın baş müəllimi, filialın Həmkarlar İttifaqı Komitəsinin sədri Çingiz Dadaşov və Sosial və xüsusi fənlər kafedrasının dosenti Zərifə Cavadova yubiley medalı ilə təltif olunublar.

## ADPU-nun rektoru və 6 alimi "Heydər Əliyevin 100 illiyi (1923-2023)" yubiley medalı ilə təltif edilib




Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə bir qrup ictimai-siyasi xadim, eləcə də alim və ziyalılar "Heydər Əliyevin 100 illiyi (1923-2023)" Azərbaycan Respublikasının yubiley medalı ilə təltif ediliblər. Təltif olunanlar arasında Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, Elmi-təşkilati şöbənin müdiri, professor İbrahim Bayramov, İbtidai təhsilin pedaqogikası kafedrasının müdiri, professor Fərrux Rüstəmov, Riyaziyyat və onun tədrisi texnologiyası kafedrasının dosenti Tinatin Əliyeva, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının dosenti Allahverdi Hacıyev və Cəbr və həndəsə kafedrasının dosenti Heydər Hüseynov da yer alır.

ADPU kollektivi adından yüksək dövlət təltifinə layiq görülmələri münasibətilə Cəfər müəllimi və dəyərli alimləri təbrik edir, yeni-yeni uğurlar arzu edirik.

## Ucar məktəbliləri Pedaqoji Universitetdə olublar



Mayın 1-də Ucar rayonu Qazıqumlaq kənd Heydər Əliyev adına 2 nömrəli tam orta məktəbin direktoru Elbrus Baxşəliyev, 5 müəllim və 50 nəfər şagirdi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsində ekskursiyada olublar. Qonaqları qarşılayan ADPU-nun Tədris departamentinin Məzun kordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova və Kimya və biologiya fakültəsinin dekan müavini, dosent Kərim Quliyev onlara universitet və fakültə haqqında ümumi məlumat veriblər. Sonra şagirdlər universitetin elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanova, Tədris departamentinin müdiri, dosent Sənan Əliyevlə və Elmi-təşkilati şöbənin müdiri, professor İbrahim Bayramovla görüşüb, ADPU-nun Heydər Əliyev muzeyi və Kitabxana-İnformasiya Mərkəzində olublar.

Kitabxana-İnformasiya Mərkəzinin müdiri Zinhara Həsənova şagirdlərə e-kitabxana haqqında ətraflı məlumat verib. Sonra şagirdlər Kimya və biologiya fakültəsinin Zoologiya muzeyində, Ümumi və qeyri-üzvi kimya, Üzvi və analitik kimya laboratoriyalarında olmuş, professor-müəllim heyəti ilə görüşmüşlər. Sonda xatirə şəkli çəkilib.

## ADPU-nun Psixoloji-pedaqoji xidmət laboratoriyasında "Açıq qapı" günü keçirilib



Mayın 5-də Məktəbəqədər təhsil fakültəsinin nəzdində fəaliyyət göstərən Psixoloji-pedaqoji xidmət laboratoriyasında tipik və atipik uşaqlar üçün "Açıq qapı" günü təşkil olunub. Fakültə dekanı, pedaqogika elmləri doktoru Nailə Hüseynovanın rəhbərliyi ilə fakültənin müəllimləri "Açıq qapı" günündə iştirak edən uşaqları ödənişsiz psixoloji-pedaqoji müayinə edib, valideynlərə övladlarının vəziyyəti haqqında tövsiyələr veriblər.

Təşkil olunmuş "Açıq qapı" günündə 40-a yaxın uşaq mütəxəssislər tərəfindən müayinə olunub, psixoloji, pedaqoji, loqopedik, defektoloji və fiziki inkişafına görə dəyərləndirmələrdən keçiriliblər.

## ADPU-nun Ağcabədi filialının tələbələri Psixologiya Elmi-Tədqiqat İnstitutunda olublar



ADPU-nun Ağcabədi filialının Pedaqogika, psixologiya və onların tədrisi texnologiyası kafedrasının müəllimləri Nərmin Həsənova və Pərişan Yolçuzadənin rəhbərliyi ilə "təhsildə sosial-psixoloji xidmət" ixtisasının tələbələri Psixologiya Elmi-Tədqiqat İnstitutunda ekskursiyada olublar.

Tələbələr institutun Fuad İbrahimbəyov adına kitabxanası, həmçinin təlim və seans otaqları ilə tanış olublar.

Daha sonra Psixologiya Elmi-Tədqiqat İnstitutunun əməkdaşı, psixoloq Lamiyə Hüseynova tələbələrə institutun tədqiqat işləri haqqında ətraflı məlumat verib.

Eyni zamanda, tələbələr institutun əməkdaşı, psixoloq Mehriban Ağabalayeva tərəfindən aparılan PEP-R təlimində iştirak ediblər.

Daha sonra Beyin və davranış laboratoriyasının rəhbəri Səyanə Əliyeva tələbələri laboratoriyanın fəaliyyəti ilə tanış edib.

Laboratoriya ilə tanışlıqdan sonra psixoloq Nərmin Vəliyeva tələbələrə "Yeniyetmələrdə psixoloji böhranın xüsusiyyətləri" mövzusunda təlim keçib və tələbələr sertifikatla təltif olunublar.

## Quba filialında Azərbaycan-Özbəkistan Türk dünyası Tanıtım və Kültür Mərkəzinin açılışı olub



Mayın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında Azərbaycan-Özbəkistan Türk dünyası Tanıtım və Kültür Mərkəzinin açılışına həsr edilmiş elmi-praktik konfrans keçirilib.

Son illər Azərbaycan elminin və təhsilinin inkişafında inteqrativ dünya təcrübəsinin öyrənilməsinə xüsusi əhəmiyyət verən Pedaqoji Universitetin Quba filialı Özbəkistan universitetləri ilə əməkdaşlığa da önəm verir. Bu istiqamətdə tədbirlər planına uyğun olaraq ADPU-nun Quba filialında Azərbaycan Dövlət Pedaqoji Universiteti, Nizami Gəncəvi adına Daşkənd Dövlət Pedaqoji Universiteti və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının birgə təşkilatçılığı ilə Azərbaycan-Özbəkistan Türk dünyası Tanıtım və Kültür Mərkəzinin açılışına həsr edilmiş elmi-praktik konfrans keçirilib. Konfransdan əvvəl filialın direktoru, dosent Yusif Alıyev və qonaqlar Ulu Öndər Heydər Əliyevin Quba şəhərində yerləşən abidəsini ziyarət ediblər. Daha sonra filiala gələn qonaqları əllərində çiçəklər və türk dövlətlərinin bayraqları olan tələbələr salamlayıblar.

Eyni zamanda konfrans çərçivəsində filialda yaradılmış "Azərbaycan mütəfəkkirləri" barelyefinin açılışı da olub. Açılış mərasimində Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti, Milli Məclisin deputatı, akademik İsa Həbibbəyli, Milli Məclisin deputatı, Azərbaycan-Özbəkistan parlamentlərarası işçi qrupunun üzvü Ceyhun Məmmədov, Bakı Slavyan Universitetinin rektoru Anar Nağıyev, ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, ümumi işlər üzrə prorektoru Tural Cəlilov, rektor müşaviri Ümid Mehdiyev və azərbaycanlı rəssam-modelyer, Əməkdar incəsənət xadimi Fəxriyyə Xələfova iştirak edib.

## ADPU-da Heydər Əliyevin 101 illiyinə həsr olunmuş festival gecəsi keçirilib



Mayın 6-da ADPU-da Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101 illiyinə həsr olunmuş festival gecəsi keçirilib.

Bədii tədbirdə Pedaqoji Universitetin rəhbərliyi, müəllim və tələbələr iştirak ediblər.

Əvvəlcə, Dövlət Himni ifa olunub, Ulu Öndərin və şəhidlərin əziz xatirələri bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, universtietdə tələbələrin sosial-ictimai fəaliyyətlərinin stimullaşdırılması, onların öz ideya və layihələrini reallaşdırmaları üçün bütün zəruri şərait təmin olunur, fəal tələbələr və tələbə təşkilatlarının işi təkcə universitet daxilində deyil, eləcə də ölkə miqyasında öz əks-sədasını verir. Bildirilib ki, Ulu Öndərin xatirəsinə həsr olunmuş tədbirlər bu sırada xüsusi yer tutur. Bu baxımdan ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin təşkil ediyi festival gecəsində də istedadlı tələbələr müxtəlif bədii yaradıcılıq nümunələrini təqdim edəcəklər.

ADPU THİK sədri Cəmilə Qurbanova çıxış edərək göstərilən diqqətə görə universitet rəhbərliyinə təşəkkür edib. O diqqətə çatdırıb ki, təşkilat tərəfindən tələbələrin bədii yaradıcılıq qabiliyyətlərinin inkişaf etdirilməsi və dəstəklənməsi istiqamətində sistematik fəaliyyət icra olunur. Vurğulanıb ki, Elm və Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaq komitəsinin təşkilatçılığı ilə keçiriləcək ali məktəb tələbələrinin Ümummilli Lider Heydər Əliyevin 101 illiyinə həsr olunmuş bədii yaradıcılıq festivalında Pedaqoji Universitetin 38 tələbəsi iştirak edəcək.

Sonra isə festivala start verilib. Festivalda universitet tələbələrinin təqdim etdikləri bir-birindən maraqlı səhnələr, mahnılar, rəqslər və şeirlər izləyicilərin ruhunu oxşayıb.

## "Heydər Əliyev və elmi potensialın inkişaf dinamikası" Respublika elmi konfransı keçirilib



Mayın 8-də ADPU-da "Heydər Əliyev və elmi potensialın inkişaf dinamikası" Respublika elmi konfransı keçirilib.

Konfransda açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, ölkəmizdə elmi potensialın inkişafı müstəqil Azərbaycanın memarı olan Ümummilli Lider Heydər Əliyevin adı ilə bağlıdır. Məhz Ulu Öndərin sovet Azərbaycanına rəhbərlik etdiyi dövrdə minlərlə azərbaycanlı gənc İttifaqın ən nüfuzlu ali məktəblərində təhsil almağa göndərildi, ölkədə ümumi və ali təhsilin əhatə dairəsi genişləndirildi, fundamental elmi tədqiqatların həyata keçirilməsinə başlanıldı. Bu çoxşaxəli siyasət bu gün də Ulu Öndər siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir, elm və təhsil sahəsində davamlı islahatlar və yeniliklər həyata keçirilir.

Sonra mövzu ətrafında məruzələr dinlənilib. Milli Məclisin deputatı, Bakı Dövlət Universitetinin (BDU) Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrasının müdiri, professor Anar İsgəndərov "Tarix yaradan və tarixi yazan Dahi", "İki sahil" qəzetinin baş redaktoru, professor Vüqar Rəhimzadə "Heydər Əliyev və Azərbaycan mətbuatı", ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov isə "Heydər Əliyev və Azərbaycan gəncliyi" mövzularında məruzə ediblər.

ADPU-nun Ədəbiyyat kafedrasının müdiri, dosent Razim Məmmədov məruzələr ətrafında çıxış edib, fikir mübadiləsi aparılıb.

Daha sonra Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş "İlin gənc alimi və tədqiqatçısı" müsabiqəsinin qaliblərinin mükafatlandırılması mərasimi keçirilib. Müsabiqənin nəticələrinə əsasən, riyaziyyat və təbiət elmləri üzrə Arəstə Həbibova və c.ü.f.d. Eldar Muradlı II yerə, Ülviyyə Aslanova və Xumarə Qəhrəmanlı III yerə, humanitar, ictimai, pedaqoji-psixoloji elmlər üzrə isə f.ü.f.d. Könül Həsənova və Sərxan Cəfərov I yerə, Aygün Kərimova isə III yerə layiq görülüblər. Qaliblərə diplom və mükafatlar təqdim olunub.

# Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümü qeyd olunub

Mayın 8-də Pedaqoji Universitetin Heydər Əliyev Mərkəzində Ulu Öndər Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş "Əbədi ömrün ikinci yüzilliyi" adlı konfrans keçirilib. Tədbirdə universitet rəhbərliyi, fakültə dekanları, şöbə, mərkəz və kafedra müdirləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbirdən əvvəl universitet rəhbərliyi, əməkdaş və tələbələr Fəxri xiyabanda Ulu Öndərin və görkəmli oftalmoloq alim Zərifə xanım Əliyevanın məzarlarını ziyarət edib, dahi şəxsiyyətin xatirəsinə ehtiramlarını ifadə ediblər.

Heydər Əliyev Mərkəzinin əməkdaşı Tərlan Ağayevin moderatorluğu ilə keçirilən konfrans Ulu Öndərin və ölkəmizin suverenliyi, ərazi bütövlüyü uğrunda şəhid olmuş Vətən övladlarının xatirəsininin yad edilməsi ilə başlayıb.

Giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, Ümummilli Lider Heydər Əliyevin şəxsiyyəti və fəaliyyəti təkcə Azərbaycanın coğrafiyası ilə məhdudlaşmır. O, hazırkı postsovet ölkələrinin tarixində də önəmli rol oynamış qlobal miqyaslı şəxsiyyətdir. Ulu Öndərin işləyib hazırladığı müstəqil dövlətçilik və azərbaycançılıq məfkurəsi bu gün də mürəkkəb geosiyasi proseslər fonunda Azərbaycanı zirvələrə aparan ideoloji baza rolunu oynamaqdadır. Heydər Əliyevin uzun illər ərzində



formalaşdırdığı möhkəm bünövrə cənab İlham Əliyevə imkan verdi ki, öz prezidentliyi dövründə Azərbaycanı sürətli inkişaf yoluna çıxarsın, ölkənin hərbi qüdrətinin durmadan artırılmasını və beynəlxalq dəstəyi təmin etsin. Məhz belə zərgər dəqiqliyi ilə ölçülüb-biçilmiş siyasət nəticəsində 30 il işğal altında qalan torpaqlarımız silah gücünə düşməndən azad edildi, ölkənin istisnasız olaraq bütün əraziləri üzərində Azərbaycan dövlətinin suverenliyi tam bərqərar olundu. Giriş nitqinin dinlənilməsindən sonra konfrans iştirakçıları Heydər Əliyevə həsr olunmuş sənədli filmə tamaşa ediblər. "Qarabağ Zəfəri – Heydər Əliyev siyasətinin davamının məntiqi nəticəsidir" mövzusunda çıxış edən ADPU-nun Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının baş müəllimi, t.ü.f.d. Taleh Cəfərov misilsiz qələbəni şərtləndirən amillərdən söz açıb.

Gənc müğənni Vüqar Muradovun ifasında "Ulu bir sərkərdə, Ulu bir öndər" mahnısının dinlənilməsindən sonra ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin əməkdaşı Taleh Mirzəyev "Ekoloji problemlərin həlli Heydər Əliyevin çoxşaxəli fəaliyyətində prioritet istiqamətlərdən biri kimi" adlı məruzə ilə çıxış edib.

Ekranda uşaq xorunun ifasında "Sən elə bir zirvəsən" mahnısı nümayiş olunub, ardınca ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Cəmilə Qurbanova "Heydər Əliyevin gənclər siyasəti: dünəndən bu günə" mövzusunda çıxış edib. Konfrans ADPU-nun "Meh" ədəbi dərnəyi üzvlərinin Zəlimxan Yaqubun "Heydər inamı" şeiri əsasında qurduğu ədəbi-bədii kompozisiyanın təqdim olunması ilə yekunlaşıb.

# ADPU-nun Şəki filialında konfrans: Heydər Əliyev və ətraf mühit



Mayın 8-də Pedaqoji Universitet və onun Şəki filialının birgə təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş "Heydər Əliyev və ətraf mühit" mövzusunda elmi-praktik konfrans keçirilib.

Konfransda ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova, Filologiya fakültəsinin dekanı, dosent Könül Həsənova, ADPU-nun Təlim-Tədris Mərkəzinin əməkdaşları, AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun əməkdaşı, professor Pərvanə İsayeva, eləcə də Şəki şəhərindəki təhsil müəssisələrinin rəhbərləri, şəhər ziyalıları, ADPU-nun Şəki filialının professor-müəllim heyəti və əməkdaşları iştirak ediblər.

Konfransdan öncə tədbir iştirakçıları Ulu Öndərin Şəki şəhər Heydər Əliyev Mərkəzinin qarşısında ucaldılmış abidəsini ziyarət ediblər.

ADPU-nun Şəki filialında davam edən konfransda filialın direktoru, dosent Vurğun Məmmədov iştirakçıları salamlayıb, konfransa qatıldıqlarına görə təşəkkür edib. Dövlət Himni səsləndirildikdən sonra Ümummilli Lider Heydər Əliyevin və ölkəmizin ərazi bütövlüyü uğrunda şəhid olmuş qəhrəman Vətən övladlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib. `Prof. Mahirə Hüseynova konfransda "Heydər Əliyev və strateji azərbaycançılıq" mövzusunda məruzə ilə çıxış edib. Natiq çıxışında Heydər Əliyevin müasir Azərbaycan dövlətçiliyinin formalaşmasında tarixi xidmətlərindən, ölkənin ictimai-iqtisadi, siyasi və mədəni həyatında əzmkarlıqla apardığı quruculuq işlərindən və islahatlardan, bu siyasi xəttin cənab Prezident İlham Əliyev tərəfindən sədaqətlə, dönmədən, qətiyyətlə və uğurla davam etdirilməsindən bəhs edib.

"Heydər Əliyevin ekoloji siyasəti (çağdaş dünyanın müasir çağırışları kontekstində)" adlı məruzə ilə çıxış edən filialın direktoru, dos. Vurğun Məmmədov bildirib ki, müasir Azərbaycanın 1969-cu ildən 2003-cü ilə qədərki tarixi dünya şöhrətli ictimai-siyasi xadim, müstəqil Azərbaycanın qurucusu Heydər Əliyevin şəxsiyyəti ilə bağlıdır. Onun ölkəyə rəhbərliyi dövründə bütün sahələrdə olduğu kimi, ekoloji siyasət sahəsində də möhtəşəm tədbirlər həyata keçirilib, davamlı ekoloji siyasət konsepsiyası işlənilib hazırlanıb, bu sahədə struktur islahatları aparılıb, 2001-ci ildə Ekologiya və Təbii Sərvətlər Nazirliyi yaradılıb.

"Ümummilli Lider Heydər Əliyevin ekoloji siyasət konsepsiyasının prioritetləri" mövzusunda təqdimatla çıxış edən filialın elmi işlər üzrə direktor müavini, dos. Nuralı Çələbiyev əsas diqqəti Ulu Öndərin ekoloji siyasət konsepsiyasının prioritetlərinə yönəldib və qeyd edib ki, bu konsepsiyada ətraf mühitin mühafizəsi, ekosistemin qorunması və artırılması, təbii ehtiyyatlardan indiki və gələcək nəsillərin rifahı naminə səmərəli istifadə olunması əsas prioritetlər olub. Məruzəçi ölkənin hazırkı ekoloji durumuna toxunaraq qeyd edib ki, Azərbaycan zəngin flora və faunaya, füsünkar təbiətə malik unikal bir coğrafi məkandır.

Konfransda çıxış edən filialın Humanitar fənlər kafedrasının baş müəllimi Rasimə Bəkirova Ümummilli Lider Heydər Əliyevin Azərbaycanda ətraf mühitin qorunması və sağlamlaşdırılması istiqamətində tarixi rolundan, Ədəbiyyat İnstitutunun professoru Pərvanə İsayeva isə Azərbaycanda ekoloji sabitliyin qorunub saxlanmasında Heydər Əliyevin xidmətlərindən bəhs edib.

Yekun nitqi ilə çıxış edən prof. Mahirə Hüseynova Ulu Öndərin əziz xatirəsinə həsr olunmuş elmi-praktik konfransın yüksək səviyyədə təşkilindən bəhs edib, gələcəkdə də belə tədbirlərin keçirilməsinin əhəmiyyətini vurğulayıb.

Konfransda Şəki şəhər 4 nömrəli musiqi məktəbinin bədii kollektivinin və ADPU-nun Şəki filialının tələbələrinin ifasında Heydər Əliyevə və doğma yurda aid ədəbi-bədii kompozisiyalar nümayiş etdirilib, nağməkar şair Mahirə Nağıqızının şeirləri və sözlərinə bəstələnmiş mahnılar səsləndirilib.

# ADPU YENİ Klub 200 nömrəli məktəbdə maarifləndirici tədbir keçirib




Mayın 8-də ADPU YENİ Klubun təşkilatçılığı ilə Gültəkin Əsgərova adına 200 nömrəli tam orta məktəbdə yol hərəkəti qaydaları ilə bağlı maarifləndirici tədbir keçirilib.

Əvvəlcə, Ümummilli Lider Heydər Əliyevin və şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yaf edilib, Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Məktəbin təlim-tərbiyə işləri üzrə direktor müavini Gülər Rəsulova çıxış edərək yol hərəkəti qaydalarını bilməyin əhəmiyyətini vurğulayıb.

Daha sonra şagirdlər üçün yol hərəkəti qaydalarını izah edən cizgi filmi nümayiş etdirilib. Pedaqoq, uşaq psixoloqu, yaşam kouçu və təlimçi Ruhəngiz Qurbanova yol hərəkəti qaydaları ilə bağlı şagirdlərə ətraflı məlumat verib.

Sual-cavab formasında davam edən tədbir şagirdlərin böyük marağına səbəb olub. Sonda Pedaqoji Universitetin tələbərinin hazırladıqları videoçarx nümayiş olunub.

# ADPU tələbələri gənc müəllim Leyla Şıxəlizadə ilə görüş keçiriblər



Mayın 8-də ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) təşkilatçılığı ilə Lənkəran rayon Jidi kənd ümumi orta məktəbinin müəllimi olduğu vaxt innovativ təlim üsulları ilə tanınan və "Fərq yaradan gənc müəllim" mükafatına layiq görülən, hazırda isə Masallı rayon Dəmirçi kənd ümumi orta məktəbində müəllim kimi fəaliyyət göstərən Leyla Şıxəlizadə ilə "Xoşbəxtlik yaxınınızdadır" adlı görüş keçirilib.

Görüşdə Leyla Şıxəlizadə qazandığı təcrübələr haqqında təəssüratlarını tələbələrlə bölüşüb. Maraqlı, diskussiya şəraitində keçən görüşdə gənc müəllim tələbələri maraqlandıran sualları cavablandırıb, həmçinin tələbələrlə şagird və müəllim arasında düzgün münasibətlə bağlı müzakirə aparıb.

# ADPU-nun Şamaxı filialında "Yaşıl artım" devizi ilə ağacəkmə aksiyası keçirilib



2024-cü ilin ölkəmizdə "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi və COP29 ilə əlaqədar ADPU-nun Şamaxı filialında tədbirlər planı tərtib olunub. Tədbirlər planına əsasən, ətraf mühitin sağlamlaşdırılması, yaşıllıqların bərpası və artırılması, su ehtiyatlarından və dayanıqlı enerji mənbələrindən səmərəli istifadənin təmin edilməsi istiqamətində ardıcıl tədbirlər, aksiyalar keçirilir.

Bu tədbirlər çərçivəsində növbəti tədbir kimi filialda "Yaşıl artım" devizi ilə ağacəkmə aksiyası keçirilib. Filialın direktoru, dosent Tünzalə Yusifova və tələbələrin fəal iştirakı ilə filialın həyətyanı sahəsində və "Şəhid məzunlarımız" güşəsində yaşıllaşdırma işləri aparılıb.

# ADPU-da "Tələbələr üçün IB təlimi" proqramını uğurla tamamlayan tələbələrə sertifikatlar verilib



Mayın 14-də Pedaqoji Universitetdə "Tələbələr üçün IB təlimi" layihəsi çərçivəsində sertifikat təqdimetmə mərasimi keçirilib.

Mərasimdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Avropa Azərbaycan Məktəbinin direktoru Françesko Bankini çıxış edərək təlimin əhəmiyyətindən və tələbələrin qazandıqları bacarıqlardan söz açıblar.

Tələbələrin təəssüratlarının dinlənilməsindən sonra təlim proqramını uğurla başa vuran tələbələrə sertifikatlar təqdim edilib.

Qeyd edək ki, Pedaqoji Universitet Avropa Azərbaycan Məktəbi ilə birgə 2023-cü ilin 7 dekabr tarixindən "Tələbələr üçün IB təlimi" adlı silsilə təlimlərə başlayıb. Təlimlərdə tələbələrə beynəlxalq bakalavr proqramın (IB) dərindən öyrədilməsi nəzərdə tutulub.

6 ay müddətində davam edən təlimlər Avropa Azərbaycan Məktəbinin direktoru Françesko Bankini tərəfindən aparılıb. Təlimin əsas məqsədi IB kurikulumunun əsas tələb və meyarları əsasında peşəkar müəllim profilini inkişaf etdirməkdir. Təlim proqramının digər məqsədi tədris prosesinin təşkili zamanı IB kurrikulumunun tətbiqi, istifadə olunan metod və alətlər, öyrətmənin effektivliyini artıran strategiyalar və onlar vasitəsilə keyfiyyətli tədris mühitinin yaradılması yollarını gələcək müəllimlərə ötürməkdir.

Ümumilikdə, ADPU-nun 7 fakültəsindən təlimə qoşulan 61 nəfər tələbədən 6 ay müddətində təlimlərdə davamlı iştirak edən 35 nəfər proqramı uğurla tamamlayaraq sertifikata layiq görülüblər.

## "ADPU-2030 Strateji İnkişaf Planı"nın işçi variantı müzakirə olunub

Mayın 13-də Keyfiyyətin təminatı şöbəsi yanında İşçi Qrupun onlayn iclası keçirilib. İclasda "ADPU-2030 Strateji İnkişaf Planı" sənədinin işçi variantı müzakirə olunub.

Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifovun giriş sözündən sonra, tədris işləri üzrə prorektor, dosent Eldar Alsanov Strateji İnkişaf Planının (SİP) məqsədi, əhəmiyyəti və ümumi iş prosesi haqqında iştirakçıları məlumatlandırıb.

Görüşdə Lətif Kəngərlinski, dosent Nazilə Abdullazadə, Səbinə Sadıqova, Əlmusa Atamalıyev, Könül Mahmudova, Şamaxı filialının Sosial və xüsusi fənlər kafedrasının müdiri, dosent Mayıl Alıcanov və digər üzvlərin SİP haqqında sualları cavablandırılıb, qeyd və əlavələri interaktiv şəkildə müzakirə olunub.

Yekunda SİP-in təkmilləşdirilməsi yönündə fikirlər və qeydlər ümumiləşdirilib, növbəti görüşlər üçün planlaşdırmalar aparılıb.



## ADPU-da professor Hyun Sook Tekinin konserti və elmi seminarı keçirilib

13-14 may tarixlərində İncəsənət və fiziki tərbiyə fakültəsinin Musiqi və onun tədrisi texnologiyası kafedrası və Beynəlxalq əlaqələr üzrə prorektorluğun nəzdində Təlim-Tədris Mərkəzinin birgə təşkilatçılığı ilə Türkiyənin Bağçaşəhər Universitetinin Konservatoriyasının professoru Hyun Sook Tekinin "Fortepiano ifaçılığı və pedaqogika" mövzusunda konsert proqramı və elmi seminarı keçirilib.

İlk gün xüsusi konsert proqramı ilə çıxış edən professor Tekin, tədbirin ikinci gününün ilk hissəsində fakültənin "Musiqi müəllimliyi" ixtisası üzrə təhsil alan tələbələri üçün ustad dərsi, daha sonra fakültənin müvafiq kafedrasının müəllimləri üçün elmi seminar keçib.



## ADPU-nun Quba filialında tədbir: Rəsulzadə və onun yaxın silahdaşı Mustafa Vəkiloğlu








Pedaqoji Universitetin Quba filialında "Rəsulzadə və onun yaxın silahdaşı Mustafa Vəkiloğlu" adlı tədbir keçirilib. Tədbirdən əvvəl qonaqlar filialla tanış olaraq, burada yeni yaradılan mərkəzlər və müasir auditoriyalarda olublar.

Ulu Öndər Heydər Əliyevin və cümhuriyyət xadimləri və şəhidlərimizin xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayan tədbirdə Azərbaycan Respublikalarının Dövlət Himni ifa edilib.

Giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Yusif Alıyev vurğulayıb ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 30 dekabr 2023-cü il tarixində Məhəmməd Əmin Rəsulzadənin 140 illiyinin qeyd edilməsi haqqında imzaladığı Sərəncama müvafiq olaraq ADPU-nun Quba filialının təşkilatçılığı ilə keçirilən tədbir həm də Azərbaycan Xalq Cümhuriyyətinin sonuncu daxili işlər naziri Mustafa Vəkiloğlu ilə bağlı "Çapar" nəşriyyatında hazırlanmış "Mustafa Vəkiloğlu: Məktublar, məqalələr" kitabının təqdimatı ilə əlamətdardır.

Direktor qeyd edib ki, böyük Vəkilovlar ailəsindən olan Müvəkkil Hüquq Mərkəzinin sədri, "Oxu" Akademiyasının rəhbəri Səməd Vəkilov, tanınmış maliyyəçi Şöhrət Vəkilov, əməkdar mühəndis Ramiz Vəkilov, Vaqif Səmədoğlu Mərkəzinin rəhbəri Nüşabə Vəkilova da tədbirdə iştirak edirlər.

Çıxış edən Səməd Vəkilov belə tədbirlərin Mustafa Vəkilov kimi dahi şəxsiyyətlərin irsi və əməli fəaliyyətlərinin öyrənilməsində əhəmiyyətini vurğulayıb. Daha sonra Mustafa Vəkiloğlunun Məhəmməd Əmin Rəsulzadə ilə münasibətlərindən, həmin dövrün ictimai-siyasi portretindən, Cümhuriyyəti-ənam (xalq cümhuriyyəti) uğrunda mübarizəsindən danışıb.

Azərbaycan Respublikası kənd təsərrüfatı nazirinin müşaviri Şöhrət Vəkilov çıxışında "Dahilər müzakirə olunmur, sadəcə öyrənilir" deyərək yalnız həmin dövrün ictimai-siyasi mənzərəsi ilə tanış olaraq bu şəxsiyyətlərin fəaliyyətini qiymətləndirə biləcəyimizə diqqət çəkib.

ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Qərbi Azərbaycan Araşdırmalar Mərkəzinin rəhbəri, tarix üzrə fəlsəfə doktoru Leyla Calalova 1918-ci il hadisələri zamanı ermənilərin elə ilk hücumlarından sonra silaha sarılan Balo bəy Vəkilov haqqında danışıb.

Tədbirdə Mustafa Vəkiloğlunun oğlu Nadir Vəkiloğlunun tarixi qələbəmiz zamanı Ali Baş Komandan İlham Əliyevə ünvanladığı təbrik videosu, filialın fakültə üzrə TEC sədri Zəhra Məmmədovanın hazırladığı "Zülmətdə parlayan işıq" adlı divar qəzeti nümayiş olunub.

Sonda tədbir iştirakçılarına "Mustafa Vəkiloğlu: Məktublar, məqalələr" kitabı hədiyyə edilib.

## ADPU-nun nümayəndələri ECAR layihəsi çərçivəsində təlimdə iştirak edib



13-14 may tarixlərində "Azərbaycanda Rektorlar Konfransının yaradılması" (ECAR) adlı "Erasmus+" layihəsi çərçivəsində növbəti təlim Azərbaycan Universitetində keçirilib.

Təlimin əsas məqsədi elmmetrik bazalar, onların iş prinsipləri, tədqiqatçılar üçün gərəkli imkanları, onlardan istifadə mexanizmləri, məqalələrin hazırlanması standartları və jurnalların seçimi, tədqiqatçı göstəricilərinin yaxşılaşdırılması metodları haqqında iştirakçılara geniş nəzəri biliklərin ötürülməsi və praktiki vərdişlərin yaradılması olub.

"Elmi məqalələrin strukturu, jurnal seçimi və təqdimatı" adlı birinci təlimdə iştirakçılara beynəlxalq indekslənmə bazalarında indekslənən jurnallarda elmi məqalələrin strukturuna qoyulan tələblər, jurnal seçimi və məqalələrin təqdimatı ilə bağlı zəruri məlumatlar verilib.

İkinci təlim isə "Web of Science" və "Scopus" elmmetrik bazalarının resurslarından istifadəyə həsr olunub.

Qeyd edək ki, təlimdə ADPU-nun Magistratura və doktorantura şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov və Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının müəllimi, filologiya üzrə fəlsəfə doktoru İlkin Əsgərov da iştirak edib.

## ADPU-nun Şəki filialında "Açıq qapı" günü keçirilib



Mayın 16-da ADPU-nun Şəki filialında "Açıq qapı" günü keçirilib.

Ümumtəhsil təhsil məktəblərinin buraxılış siniflərinin şagirdlərinin filialda tədris prosesi, mövcud şöbə və bölmələrin işi ilə yaxından tanış olmalarını təmin etmək və qəbul aparılacaq ixtisaslar haqqında məlumat vermək məqsədi ilə keçirilən "Açıq qapı"da Şəkinin ümumtəhsil məktəblərinin şagirdləri iştirak ediblər.

Əvvəlcə, filialın direktoru, dosent Vurğun Məmmədov şagirdlərlə görüşüb, onlara təhsildə uğurlar arzulayıb və 30 ildən artıq müddətdə fəaliyyət göstərən filialda zəngin ənənələrin olduğunu, güclü kadr potensialının mövcudluğunu, təhsil almaq üçün gənclərə əlverişli mühit yaradıldığını diqqətə çatdırıb.

Filialın akt zalında davam edən görüşdə tədris işləri üzrə direktor müavini, dos. Gülarə Abdullayeva, Təbiət fənləri və onların tədrisi texnologiyası kafedrasının müdiri, professor Firədun İbrahimov və Karyera Mərkəzinin müdiri Xuraman Həmidova şagirdlərə filialın struktur və bölmələri, qəbul aparılan ixtisaslar, filialda tələbələrin asudə vaxtlarının səmərəli təşkili istiqamətində görülən işlər və tələbə təşkilatları barədə ətraflı məlumat veriblər. Daha sonra şagirdlər filialın ayrı-ayrı struktur bölmələri və auditoriyalarda olub, onlara canlı iş və tədris prosesi ilə tanış olmaq üçün şərait yaradılıb.

# Magistraturaya qəbul imtahanlarında yüksək bal toplayan tələbələr üçün infosessiya təşkil olunub

Mayın 16-da ADPU-da Tədris departamentinin Məzun koordinasiya və karyera şöbəsinin təşkilatçılığı ilə magistratura səviyyəsinə qəbul imtahanlarında yüksək nəticə göstərmiş sonuncu tədris ili tələbələri ilə infosessiya keçirilib.

İnfosessiyada magistraturaya qəbul imtahanlarında iştirak edən ADPU-nun 600-dək tələbəsindən yüksək nəticə göstərmiş 200-dən çox tələbə iştirak edib.

Giriş sözü ilə çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov son illər Pedaqoji Universitetdə təhsilin, o cümlədən magistratura səviyyəsində kadr hazırlığının keyfiyyətinin yüksəldilməsi, dövrün tələblərinə uyğun olaraq yeni ixtisaslaşmaların açılması haqqında danışıb, ADPU-da yalnız magistrantlar üçün nəzərdə tutulmuş xüsusi "Magistrant" dövri-elmi jurnalının nəşr olunduğunu, hər il respublika elmi konfranslarının keçirildiyini diqqətə çatdırıb. Bildirilib ki, bakalavrlar hazırda ADPU-nun magistratura səviyyəsində müəllimlik ixtisasları üzrə metodika, SABAH magistratura, menecment, təhsilin təşkili və idarə olunması, təlim və tədrisin təşkili və metodikası, gənclərlə iş, sosial iş, habelə ADPU-CVU ikili diplom proqramında təhsillərini davam etdirə bilərlər.

Çıxış edən Elmi-təşkilati şöbənin müdiri, prof. İbrahim Bayramov qeyd edib ki, hər bir ali təhsil müəssisəsinin əsas göstəricilərindən biri onun məzunlarının uğurlarıdır. Bu baxımdan ADPU hər bir məzununu diqqətlə izləyir və onların bakalavriatdan sonrakı elmi-pedaqoji inkişaflarında da olduqca maraqlıdır.



Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova vurğulayıb ki, Pedaqoji Universitetdə tələbə və məzunların fəaliyyəti daimi olaraq izlənilir və onlarla qarşılıqlı fəaliyyət icra olunur. Diqqətə çatdırılıb ki, hazırda Bakı şəhərindəki 86 ümumtəhsil məktəbinin direktoru, eləcə də regionlarda təhsil sahəsində qabaqcıl rəhbər vəzifə tutan 967 nəfər ADPU məzunu var.

Gənc müəllim, dosent Şəbnəm Əsədova tələbələrin magistr ixtisasları seçərkən dövrün aktual peşələrinə və maraq dairələrinə uyğun olaraq ən uğurlu olacaqları sahəni seçmələrinin vacibliyini vurğulayaraq, təhsil menecmenti, marketinqi, təlim və tədrisin təşkili və metodikası sahələri üzrə Pedaqoji Universitetdə yüksəksəviyyəli magistrlərin hazırlandığını diqqətə çatdırıb.

Daha sonra infosessiya tələbələrin Pedaqoji Universitetdə magistratura təhsili almaqla bağlı müxtəlif suallarının cavablandırılması ilə davam edib.

# Prorektor Könül Pirverdiyeva Gəncədə keçirilən forumda təqdimatla çıxış edib



Mayın 10-da Ümummilli Lider Heydər Əliyevin əziz xatirəsinə həsr olunmuş "İbtidai Sinif Müəllimlərinin Gəncə Forumu" keçirilib.

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU), Azərbaycan Kitab, Maarif və Poliqrafçılar İctimai Birliyi, "Çinar yayımları", "Təhsil" və "Everest" nəşriyyatlarının birgə təşkilatçılığı ilə keçirilən forumda 900 müəllim iştirak edib.

Forumda ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva "Məktəb bir peşəkar öyrənən icma kimi" mövzusunda təqdimat edib.

Təqdimatda qeyd olunub ki, təhsil müəssisələrinin öyrənən təşkilatlar kimi layihələndirilməsi və fəaliyyəti günümüzün çox sürətli sosial-iqtisadi dəyişikliklərinə uyğunlaşmaq və öyrənənlərə dövrün gözləntilərinə uyğun bacarıqlar vermək baxımından mühüm əhəmiyyət kəsb edir.




Məktəbin biliyin kəşfi və innovasiya proseslərindəki fəal rolunun öyrənmə təcrübələrini daha maraqlı və effektiv etdiyini göstərən akademik araşdırmaların nəticələrini paylaşan prorektor, şəxsi və peşəkar inkişaf, təlim strategiyaları və liderlik təcrübələrinin məktəbin öyrənən təşkilata çevrilmə yolunda necə transformativ təsir yarada biləcəyini nümunələr əsasında qeyd edib.

Qeyd edək ki, Ümummilli Lider Heydər Əliyevin 100 illiyi münasibəti ilə ötən ildən başlayaraq silsilə formada keçirilən "İbtidai Sinif Müəllimlərinin Forumu" Bakıda, Naxçıvanda, Sumqayıtda və son olaraq Gəncədə baş tutub.

# Türkiyənin Azərbaycandakı səfiri ADPU-da olub



Mayın 15-də Türkiyənin Azərbaycandakı səfiri Cahit Bağçı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) V tədris binasında olub.

Səfir Azərbaycan Respublikasının elm və təhsil nazirinin müavini Həsən Həsənli, elm və təhsil nazirinin müşaviri, Azərbaycan Respublikasının Təhsil İnstitutunun direktoru səlahiyyətlərini müvəqqəti icra edən Elnur Əliyev və ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyevanın müşayiəti ilə tədris binasında tədris mühiti və dərs prosesi ilə tanış olub.

Ziyarət zamanı C.Bağçı ADPU-nun Strateji İnkişaf Mərkəzinin fəaliyyəti, ABŞ-nin Corc Vaşinqton Universiteti ilə birgə magistratura üzrə ikili diplom proqramı, bakalavr və magistratura səviyyələri üzrə "SABAH" qruplarının tələbələri, Elm və Təhsil Nazirliyi və "Alqoritmika" şirkətinin birgə əməkdaşlığı çərçivəsində ADPU tələbələri ilə həyata keçirilən "Alqoritmika - rəqəmsal bacarıqların inkişafı" layihəsinin iştirakçıları üçün burada yaradılan tədris mühiti və dərs prosesinin təşkili haqqında məlumatlandırılıb.

Qeyd edək ki, ADPU-nun V tədris binasında təxminən 550 nəfərə yaxın tələbə təhsil alır.

# "Növbəti dayanacaq: İmtahan" adlı tədbir keçirilib






ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) təşkilatçılığı ilə "Növbəti dayanacaq: İmtahan" mövzusunda əyləncəli bədii tədbir keçirilib.

İmtahan öncəsi tələbələrə motivasiya vermək məqsədi ilə keçirilən tədbirdə musiqili "Dərs prosesi" səhnəciyi, rəqslər, tələbələrin ifalarında qarmonda və pianoda müxtəlif musiqilər səsləndirilib.

Həmçinin tədbir zamanı tələbələrlə əyləncəli oyunlar keçirilib. Oyunda iştirak edən tələbələrə və qalib olan 2 tələbəyə hədiyyələr təqdim olunub.

# Pedaqoji Universitetdə prof. Buket Ağqoyunlunun ustad dərsi təşkil olunub

Mayın 16-da ADPU-nun Pedaqoji Forumunun XV dinləməsi keçirilib.

Elm və Ali Təhsil üzrə Dövlət Agentliyi, SABAH Qrupları İcra Komitəsi və Pedaqoji Universitetin birgə təşkilatçılığı ilə keçirilən növbəti dinləmədə Türkiyənin Çankara Universitetinin professoru Buket Ağqoyunlunun "Gələcəyin təhsilində yeni müəllimlərin müasir bacarıqları" mövzusunda ustad dərsi dinlənilib.

Giriş sözü ilə çıxış edən ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov diqqətə çatdırıb ki, prof. B. Ağqoyunlu 30 ildən artıq müddətdə Hacəttəpə Universitetində təhsil sahəsində araşdırmalar aparıb, 2017-ci ildən isə Çankara Univeristetində professor və rektor köməkçisidir. Professorun tədqiqatları, əsasən, tədris dizaynı, vebəsaslı təlim dizaynı, e-tədris dizaynı, ali təhsildə süni intellekt savadlılığı, tədris dizaynında və öyrənmə təcrübəsində süni intellekt, həmçinin informasiya savadlılığı və rəqəmsal savadlılığa yönəlib.

Daha sonra prof. B.Ağqoyunlunun ustad dərsi dinlənilib. Dərs sual-cavab sessiyası ilə yekunlaşdırılıb.

Çıxış edənlərdən Elm və Təhsil Nazirliyi yanında Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin sektor müdiri Elza Səmədli və ADPU-nun rektoru, professor Cəfər Cəfərov Pedaqoji Forum çərçivəsində bu kimi aktual mövzularda ölkəmizdə və xaricdə tanınmış alimlərin, təhsil tədqiqatçılarının ustad dərslərinin təşkilini yüksək qiymətləndirərək, belə tədbirlərin elmi-pedaqoji ictimaiyyətin nümayəndələri üçün önəmini vurğulayıblar.




Qeyd edək ki, dinləmədə Pedaqoji Universitet və pedaqoji kadr hazırlayan universitetlərin professor-müəllim heyəti, o cümlədən pedaqoji ixtisaslar üzrə təhsil alan magistrantlar və doktorantlar iştirak ediblər.

# Filologiya fakültəsində "Heydər Əliyev dərsləri"nin ilk məşğələsi keçirilib

Mayın 17-də ADPU-nun Heydər Əliyev Mərkəzi tərəfindən təşkil olunan dərslərin növbəti məşğələsi Filologiya fakültəsində baş tutub. Fakültənin "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının AZD2206B və AZD2207B nömrəli qrup tələbələrinin iştirak etdiyi məşğələ universitetin əsas tədris binasında yerləşən Heydər Əliyev muzeyindən başlayıb. Mərkəzin baş mütəxəssisi Aynurə Əsgərova tələbələri burada nümayiş etdirilən eksponatlarla tanış edib, onlara arxiv sənədlərinin surətləri, fotoşəkillər, kitablar, suvenirlər və s. haqqında ətraflı məlumat verib.

Heydər Əliyev məktəbinin lektoriyasında davam edən dərsdə "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" mövzusunda mühazirə ilə çıxış edən mərkəzin müdiri Tahir Süleymanov Ümummilli Liderin şəxsiyyəti, fəaliyyəti, ölkə və xalq qarşısındakı xidmətləri haqqında danışıb, 1969-2003-cü illər arasındakı böyük bir zaman kəsiyinin "Heydər Əliyev dövrü" kimi Azərbaycan tarixinə haqq olunduğunu qeyd edib.

Mühazirədən sonra dünyanın tanınmış dövlət xadimlərinin Ulu Öndər haqqında söylədiyi fikirləri əks etdirən slaydlar nümayiş etdirilib. Dərsin "film saatı" adlandırılan hissəsində filoloqlar "Böyük lider Heydər Əliyevin həyat yolu" adlı sənədli filmə tamaşa ediblər.



Son olaraq, dərs boyunca verilmiş məlumat və materiallar əsasında tələbələrə suallar ünvanlanıb, Ümummilli Liderin həyat və fəaliyyətinin müxtəlif aspektləri ətrafında fikir mübadiləsi aparılıb.

Ümumiyyətlə, ADPU-da təşkil olunan "Heydər Əliyev dərsləri"ndə indiyədək universitetin müxtəlif fakültələrindən 1000-dən çox tələbə iştirak edib. Təqvim ilinin sonunadək dərslərin qrafik əsasında digər qrup və fakültələrdə də davam etdirilməsi nəzərdə tutulur.

# "İbtidai siniflər üçün inklüziv tədris bacarıqları" proqramı uğurla başa çatıb



Mayın 20-də ADPU-da "İbtidai təhsil müəllimliyi" üzrə ixtisaslaşan bakalavr tələbələrinin inklüziv tədris bacarıqlarının inkişaf etdirilməsini hədəfləyən, "bp" və şirkətin Azəri-Çıraq-Günəşli, Bakı-Tbilisi-Ceyhan, Şahdəniz və Cənubi Qafqaz Boru Kəməri layihələrindəki tərəfdaşları – "TPAO", "SOCAR", "SGC", "LUKOİL", "NİCO", "MOL", "Equinor", "İNPEX", "ExxonMobil", "İTOCHU", "Eni", "TotalEnergies", "ONGCVidesh" - ilə birgə icra olunan mühüm təlim proqramının mükafatlandırma mərasimi keçirilib. Pedaqoji Universitetin İbtidai təhsil fakültəsinin təxminən 140 tələbəsi təlim proqramında iştirak edərək inklüziv təhsilin innovativ metodlarına və xüsusiyyətlərinə yiyələnib. Sonda onlara beynəlxalq sertifikatlar verilib. Proqramın məzmununun əsasını empatiya və hörmət, insanların fərdi xüsusiyyətlərini nəzərə almaqla hər bir şəxs üçün təhlükəsiz, uyğun və məqbul bir mühit yaradılması kimi bacarıqlar təşkil edib. Proqram "DanceAbility®" adlanan beynəlxalq təlim metoduna əsaslanıb və bu metod universal ünsiyyət üsullarından istifadə etməklə əlilliyi olan insanların müalicəsində və reabilitasiyasında inklüzivliyi əhatə edir.

Metodun mahiyyəti hərəkətlərdə harmoniya və koordinasiya əldə etməklə bədii ifadə, improvizasiya, ünsiyyət və özünəinamı təmin edən hərəkətləri öyrətmək və məşq etməkdən ibarətdir.

Bu metod əsasən həssas qrup insanların, o cümlədən fiziki və əqli əlilliyi olan şəxslərin – uşaqlar, yeniyetmələr, yaşlılar, müharibə veteranları və digərlərinin təhsil və təlimində istifadə olunur. Sertifikatların təqdim olunması tədbirində çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, təhsilverənlərdə inklüziv bacarıqların artırılması dövlət, cəmiyyət və universitet olaraq qarşımızda duran ən vacib çağırışlardan biridir və bu istiqamətdə çeşidli addımlar atılır, ADPU-da İnklüziv Təhsil Mərkəzi fəaliyyət göstərir. Rektor həyata keçirilən proqramın bu fəaliyyətlərin inkişafında önəmli tədbirlərdən biri olduğunu diqqətə çatdırıb və dəstəyə görə "bp" və tərəfdaşlarına təşəkkür edib. "bp"-nin Xəzər regionu üzrə vitse-prezidenti Bəxtiyar Aslanbəyli deyib: "Hesab edirik ki, bu layihə inklüziv təhsilin əhəmiyyəti barədə məlumatlılığın artırılması səylərinə mühüm töhfədir. Daha geniş kontekstdə, layihə təkcə təhsildə deyil, bütövlükdə cəmiyyətdə inklüzivlik hissini təşviq etmək məqsədi daşıyır. Elə bir inklüziv cəmiyyət ki, orada insanlara ədalətli və bərabər münasibət göstərilir, hər bir insan özünü dəyərli hiss edir, xoş qarşılanır və hörmət görür. İnanırıq ki, bu hissi və bu mədəniyyəti kiçik yaşlardan aşılamaq vacibdir və məhz buna görə də diqqətimizi ibtidai siniflərə yönəltməyə qərar verdik." Qeyd edək ki, yeddi aylıq (oktyabr 2023 - may 2024) layihənin ümumi dəyəri təxminən 78000 AZN təşkil edib.

# Fizika fakültəsində "Gələcəyə addım" VI elmi konfransı keçirilib

Mayın 17-də Fizika fakültəsinin Tələbə Elmi Cəmiyyətinin (TEC) Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş "Gələcəyə addım" VI elmi konfransı keçirilib. Konfransda fakültə rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak edib.

Konfransı giriş sözü ilə açan fakütə TEC-nin sədri, dosent Xatirə Adgözəlova TEC-nin fəaliyyəti haqqında təqdimatla çıxış edib. Qeyd edilib ki, konfransa ümumilikdə 82 tezis təqdim olunub.

Çıxış edən Fizika fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov tələbələrin elmi-tədqiqat işlərinə cəlb edilməsinin əhəmiyyətindən danışaraq qeyd edib ki, ilk dəfə olaraq konfransın bölmələrinə "STEAM – müasir təhsil metodu" bölməsi daxil edilib. Bu bölmə üzrə digər fakültələrdə təhsil alan tələbələr də iştirak edir.



Daha sonra "Fizika günü" tədbirində fəallığı və ictimai fəaliyyəti ilə fərqlənən tələbələrə "Dean Honor list" (Dekanın fəxri diplomu) təqdim edilib.

Çıxış edən Ədliyyə Nazirliyinin Ekspertiza Mərkəzinin şöbə müdiri və BDU-nun Optika və molekulyar fizika kafedrasının dosenti Lətif Əliyev konfransın keçirilməsinin əhəmiyyətindən danışıb, iştirakçılara uğurlar arzulayıb.

Plenar iclasda Fizika fakültəsinin III tədris ili tələbəsi Nərmin Həsənovanın "STEAM ilə dəstəklənən öyrənmə – tələbələrdə sahibkarlıq bacarıqlarının inkişafı" mövzusunda çıxışı dinlənilib.

Daha sonra konfrans 6 bölmə üzrə fəaliyyətini davam etdirib.

Yekunda uğurlu çıxış edən tələbələrə diplom və sertifikatlar təqdim edilib.

## Mühazirə: Qərbi Azərbaycana qayıdış: tarixi torpaqlarda maddi-mədəni irsimiz



Mayın 17-də Tarix və coğrafiya fakültəsində Sosial Tədqiqatlar Mərkəzinin sektor müdiri, s.ü.f.d. Əfqan Vəliyev "Tarix müəllimliyi" ixtisasının TAR2301B, TAR2302B, TAR2303B və TAR2304B qrupları üçün "Qərbi Azərbaycana qayıdış: tarixi torpaqlarda maddi-mədəni irsimiz" mövzusunda mühazirə ilə çıxış edib.

Əfqan Vəliyevin mühazirəsi fakültənin professor-müəllim heyəti və tələbələr tərəfindən maraqla qarşılanıb və mövzu ilə bağlı müzakirələr aparılıb.

Sonda qonaq fakültəyə "Qərbi Azərbaycana qayıdış: tarixi torpaqlarda maddi-mədəni irsimiz" və "Tarixi Azərbaycan torpaqlarında maddi-mənəvi irsimiz" kitablarını hədiyyə edib.

## ADPU-nun Strateji İnkişaf Mərkəzi PISA 2025 üzrə infosessiyalar təşkil edib



Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi (AR ETN) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Strateji İnkişaf Mərkəzinin (ADPU SİM) birgə təşkilatçılığı ilə PISA 2025 Beynəlxalq Şagird Qiymətləndirmə Tədqiqatının sınaq mərhələsi üzrə infosessiyalar təşkil olunub.

Beynəlxalq Şagird Qiymətləndirmə Proqramı olan PISA (Programme for International Student Assessment) ümumi təhsil müəssisələri üzrə 15 yaşlı şagirdlərin oxu, riyaziyyat, təbiət elmləri və yaradıcı düşünmə üzrə bilik və bacarıqlarını qiymətləndirmək, eyni zamanda şagirdlərin bu bacarıqları real həyatda tətbiq etmək qabiliyyətlərini müəyyənləşdirmək məqsədilə təşkil olunur.

İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (OECD) tərəfindən 3 ildən bir həyata keçirilən bu beynəlxalq qiymətləndirmə tədqiqatında XXI əsrdə öyrənənlərin mürəkkəb problemləri həll etməyə, tənqidi düşünməyə və effektiv ünsiyyət qurmağa necə hazır olduqlarının ölçülərək dəyərləndirilməsi əsas hədəf olaraq ortaya qoyulur.

ADPU SİM tərəfindən 6-9 may 2024-cü il tarixləri aralığında onlayn formatda həyata keçirilən infosessiyalarda paytaxt və digər regionlardan riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı, biologiya, fizika, kimya, coğrafiya fənləri üzrə tədqiqata cəlb olunan məktəblərdə tədris aparan 800 nəfərə yaxın müəllim, həmçinin həmin məktəblərin direktor müavinləri iştirak ediblər.

İnfosessiyalarda PISA 2025-də öyrənənlərin məktəbdə və məktəbdən kənarda öyrəndiklərini sosial həyata qatılmaq üçün nə dərəcədə istifadə edə bildiyinin qiymətləndiriləcəyi, onların öyrənmə prosesinə yanaşmaları, münasibətləri və motivasiyaları haqqında məlumatların toplanacağı qeyd olunub.

İnfosessiyanın sonunda fənn müəllimlərinə PISA beynəlxalq tədqiqatının öncəki dövrlərində istifadə olunmuş suallar, həmçinin 2025-ci il üçün nəzərdə tutulan nümunə suallar təqdim olunub, müzakirələr əsasında nümunə suallar üzrə iş aparılıb.

## Türkiyə universitetlərinin rektorları ADPU-nun 100 illik yubiley medalı ilə təltif olunublar



Mayın 21-də Azərbaycanın Türkiyədəki Səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova, Türkiyənin Qazi Universitetinin rektoru Musa Yıldız, Ankara Universitetinin rektoru Necdət Ünüvar və Hacəttəpə Universitetinin rektoru Mehmet Cahit Güran Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olublar.

Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynova, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova qonaqlarla görüşüblər.

Görüş zamanı ADPU-nun rektoru, professor Cəfər Cəfərov Türkiyə-Azərbaycan münasibətlərinin bütün türk dünyası üçün layiqli nümunə olduğunu vurğulayıb, "bir millət, iki dövlət" prinsipi əsasında qurulan münasibətlərin yüksək səviyyədə olduğunu bildirib. Rektor Cəfər Cəfərov, həmçinin ADPU-da həyata keçirilən islahatlar, infrastrukturun yenilənməsi, təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsilin beynəlmiləlləşdirilməsi, beynəlxalq əlaqələrin genişləndirilməsi, xarici dilin tədrisi səviyyəsinin yüksəldilməsi sahəsində gerçəkləşən tədbirlər barədə ətraflı məlumat verib. Daha sonra ADPU və Türkiyə universitetləri arasında mövcud əlaqələrin genişləndirilməsi, elmi əlaqələrin qurulması, akademik həyat və tələbələrin qarşılıqlı mübadilə perspektivləri müzakirə olunub.

Görüşdə, həmçinin Azərbaycanın Türkiyədəki Səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova və rektorlar Musa Yıldız, Necdət Ünüvar və Mehmet Cahid Güran "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunublar. Yekunda qonaqlar universitetin tədris binası, eləcə də ADPU-da fəaliyyət göstərən Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi, Türksoy kafedrası, Türkoloji Mərkəz, Heydər Əliyev muzeyi, akt zalı və kitabxana ilə tanış olub, yeni açılmış "Türk dili və ədəbiyyatı müəllimliyi" ixtisasının tələbələri ilə görüşərək dərs prosesini izləyiblər.

## 12 saylı xüsusi internat məktəbinin müəllim və şagirdləri ADPU-da olublar



Mayın 21-də Bakı şəhəri 12 saylı xüsusi internat məktəbinin şagirdləri Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ekskursiyada olublar. "SİM uşaqların cəmiyyətə inteqrasiyası" devizi ilə təşkil olunan ekskursiyada xüsusi internat məktəbindən gələn müəllim və şagirdlər ADPU-nun Tədris departamentinin direktoru, dosent Sənan Əliyev, rektorun köməkçisi Riyad Rüstəmli və Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova ilə görüşüblər.

Universitetin Heydər Əliyev muzeyi və elektron kitabxanası ilə tanış olan müəllim və şagirdlərə Kitabxana-İnformasiya Mərkəzinin müdiri Zinharə Həsənova geniş məlumat verib, ADPU-da inklüziv təhsil mühitinin təmin olunması istiqamətində atılan addımlardan danışıb. Daha sonra şagirdlər universitetdə iş və dərs mühiti ilə tanış olublar.

## ADPU-da "STEAM FABLAB" sərgi-yarmarkası keçirilib






Mayın 21-də Pedaqoji Universitetdə Fizika fakültəsinin təşkilatçılığı ilə "STEAM FABLAB" sərgi-yarmarkası keçirilib.

Sərgidə Fizika fakültəsinin tələbələrinin STEAM Mərkəzində hazırladıqları əl işləri nümayiş olunub, həmçinin satışı təşkil olunub.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov, eləcə də ADPU-da səfərdə olan Azərbaycanın Türkiyədəki Səfirliyinin təhsil müşaviri Nəcibə Nəsibova və Türkiyənin Qazi Universitetinin rektoru Musa Yıldız, Ankara Universitetinin rektoru Necdət Ünüvar və Hacəttəpə Universitetinin rektoru Mehmet Cahit Güran sərgi-yarmarkaya baxış keçiriblər.

ADPU-nun professor-müəllimləri, əməkdaşları və tələbələri sərgi-yarmarkada təqdim olunan müxtəlif əl işlərini maraqla qarşılayıblar.

## Pedaqoji Universitetdə "Heydər Əliyev - Unudulmaz Lider" adlı foto-xalça sərgisinin təqdimatı keçirilib



Mayın 21-də ADPU və "Qeyd – Sosial Maarifləndirmə" İctimai Birliyinin birgə təşkilatçılığı ilə "Heydər Əliyev – Unudulmaz Lider" adlı foto-xalça sərgisinin təqdimat mərasimi keçirilib.

Tədbirdə Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, Milli Məclisin deputatları Ceyhun Məmmədov və Pərvin Kərimzadə, Demokratiya və İnsan Hüquqları Komitəsinin sədri, hüquq üzrə fəlsəfə doktoru Çingiz Qənizadə, "Qeyd – Sosial Maarifləndirmə" İctimai Birliyinin sədri Tural Nurməmmədov və baş katibi Aysel Tahirova iştirak ediblər.

Sərgi iştirakçıları dahi şəxsiyyət, Ümummilli Lider Heydər Əliyevin həyatını və dövlətçilik fəaliyyətini əks etdirən fotoların əks olunduğu xalçalara baxış keçiriblər.

Qeyd edək ki, xalçalar üzərində toxunmuş əl işləri sərgi iştirakçıları tərəfindən maraqla qarşılanıb.

# “Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri” müsabiqəsinin qalibləri mükafatlandırıldı

Mayın 24-də “Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri” müsabiqəsinin bağlanışı və qaliblərin mükafatlandırılması mərasimi keçirilib.

Mərasimdə açılış nitqi ilə çıxış edən müsabiqənin Təşkilat Komitəsinin sədri, Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov vurğulayıb ki, ADPU və onun filiallarının bakalavriat və magistratura səviyyəsində təhsil alan tələbələri üçün təşkil olunan “Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri” müsabiqəsinin məqsədi Universitetin istedadlı tələbələrini aşkar edərək onların peşəkar inkişafına dəstək olmaq və gələcək kadr bankı formalaşdırmaqdır.

Rektor deyib: “Biz inanırıq ki, 4 ay ərzində davam edən uzun və gərgin prosesin yekununda 900-dək iştirakçı arasından seçilərək müsabiqədə qalib gələn tələbə və magistrantlarımız gələcəkdə universitetimizdə, eləcə də ölkəmizin təhsil sferasında öz layiqli yerlərini tutacaq və aparılan genişmiqyaslı təhsil islahatlarına, ölkə təhsil sisteminin hərtərəfli inkişafına böyük töhfələr verəcəklər”.

Bildirilib ki, həyata keçirilən müsabiqə idarəetmə və təhsilin inkişafı sahəsində ölkəmizdə və dünyada baş verən müsbət dinamikadan ilhamlanaraq bu prosesi daha da stimullaşdırmaq və sistemləşdirmək təşəbbüslərindən qaynaqlanır. Bu kimi təcrübənin Azərbaycan ali təhsil müəssisələri arasında ilk dəfə olaraq Pedaqoji Universitetdə həyata keçirilməsi isə ayrı bir qürur və məsuliyyət hissi doğurur. ADPU müsabiqənin növbəti illərdə də davam etdirilməsi və digər ali təhsil ocaqları ilə də bu təcrübəni paylaşmaqda maraqlıdır.

Müsabiqənin gedişi ilə bağlı videoçarxın nümayişindən sonra çıxış edən Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin şöbə müdiri Samir Həmidov və Təhsilin İnkişafı Fondunun İdarə Heyətinin sədr müavini, III “Yüksəliş” müsabiqəsinin qalibi Xanım Daşdəmirova da bu kimi təşəbbüslərin təhsilin inkişafı və gənclərin təhsil idarəetməsinə cəlb olunması sahəsində unikal bir model kimi diqqət doğurduğunu qeyd edib, müsabiqə qaliblərinin yaradılan imkanlardan bəhrələnmələrini, eləcə də universitetlə yanaşı digər təhsil idarəetmə qurumlarında da inkişaf proqramlarına cəlb olunmalarının vacibliyini qeyd ediblər.








Daha sonra müsabiqənin ekspertləri, finalçıları, xüsusi mükafatçıları və qalibləri təltif olunublar.

Təranə Ağaverdiyeva (Məktəbəqədər təhsil fakültəsi, III tədris ili), Nəzrin Aslanlı (Filologiya fakültəsi, IV tədris ili), Aygül Əliyeva (SABAH qrupları, IV tədris ili), Aida İbrahimova (Kimya və biologiya fakültəsi, II tədris ili), İsmət Qəribov (SABAH magistratura, I tədris ili), Ayişə Çunayeva (Riyaziyyat fakültəsi, IV tədris ili), Aysel Şəfiyeva (SABAH magistratura, II tədris ili), Ruqiyyə Məmmədova (Kimya və biologiya fakültəsi, V tədris ili), Rəhim Kərimov (SABAH magistratura, I tədris ili) və Murad Fərhadlı (Magistratura, I tədris ili) müsabiqənin qalibi olub, Validə İsmayılzadə (Filologiya fakültəsi, I tədris ili), Fidan Nəzərəliyeva (Filologiya fakültəsi, II tədris ili), Sürəyya İslamova (SABAH qrupları, III tədris ili), Elza Nəsibova (SABAH qrupları, IV tədris ili), Elnarə Məmmədova (Tarix və coğrafiya fakültəsi, V tədris ili), Bənövşə Dursunəliyeva (SABAH qrupları, III tədris ili), İlkin Quluzadə (Magistratura, I tədris ili), Səfa İdrisov (Kimya və biologiya fakültəsi, II tədris ili), Nəsibə Qəhrəmanova (Magistratura, I tədris ili) və Günay Əhmədova (Riyaziyyat fakültəsi, III tədris ili) isə xüsusi mükafata layiq görülüblər.

“Sən də bacararsan!” şüarı ilə keçirilən müsabiqənin 10 qalibinin hər biri 1000 AZN məbləğində pul mükafatı, eləcə də müsabiqənin sponsorları olan “bp” tərəfindən akademik nəşrlər və hədiyyələr, “Prestij-S” Tədris Mərkəzi tərəfindən 1 illik xarici dil paketi və “IT Brains Academy” tərəfindən İT üzrə 1000 AZN-lik təhsil paketi əldə ediblər. Ən əsası isə qaliblərə Təşkilat Komitəsi tərəfindən təyin olunacaq mentorlarla 1 illik peşəkar inkişaf proqramı və kadr bankına əlavə olunma imkanı təqdim olunur. Eləcə də, müsabiqədə yüksək bacarıq göstərərək fərqlənən digər 10 finalçı müsabiqənin xüsusi mükafatçısı kimi hədiyyələrlə təltif olunub və onlar da 1 illik mentorluq proqramında iştirak edərək peşəkar bacarıqlarını inkişaf etdirmək şansı qazanıblar. Müsabiqənin finalçıları da kadr bankına əlavə olunmaqla müvafiq sertifikat əldə edəcəklər.

## ADPU-da MİQ imtahanı verəcək sonuncu tədris ili tələbələri ilə motivasiya görüşü keçirilib

Mayın 24-də ADPU-da Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdir müavini Anar Məmmədovla Müəllimlərin İşə Qəbulu (MİQ) imtahanlarına hazırlaşan sonuncu tədris ili tələbələrinin motivasiya görüşü keçirilib. Görüşdə sonuncu tədris ilində təhsil alan bakalavriat və magistrantlar iştirak ediblər.

Görüşdə giriş sözü ilə çıxış edən ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov ölkə müəllimlərinin böyük qisminin Pedaqoji Universitet məzunları olduğunu diqqətə çatdırıb və son illərdə ADPU-dan məzun olan gənc müəllimlərin MİQ imtahanlarında yüksək nəticələr göstərdiyini bildirib.

Prorektor qeyd edib ki, bu formatda görüşlərin keçirilməsində əsas məqsəd gələcəyin müəllimləri ilə təhsil idarəçilərini bir araya gətirərək onlara stimul vermək və peşə hazırlıqlarına dəstək göstərməkdir.

“Gənc müəllimlərin təhsilin inkişafında rolu” mövzusunda təqdimatla çıxış edən Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdir müavini Anar Məmmədov gəncliyin bütün sahələrdə olduğu kimi təhsil sahəsində də əsas aparıcı qüvvə olduğunu vurğulayıb. Gənc məzunların təhsilin inkişafı prosesində oynadıqları müsbət rola diqqət çəkən spiker qeyd edib ki, onlar cəmiyyətdə və şagirdlər arasında öyrənməni təbliğ edir, inkişaf üçün cəsarət verir, birlik yaradır və ən əsası sosial körpü rolunu oynayır. Daha sonra görüş tələbələrin suallarının cavablandırılması ilə davam etdirilib.

Qeyd edək ki, bu qəbildən olan ilk görüşün spikeri Anar Məmmədov 2001-ci ildə Dövlət İdarəçilik Akademiyasından məzun olub. 2002-2010-cu illərdə müxtəlif yerli və beynəlxalq araşdırma şirkətlərində çalışıb, eyni zamanda “Səmərəli ünsiyyət texnikaları”, “Arqumentasiya və inandırma”, “Özünüinkişaf potensialının qiymətləndirilməsi”, “İdarəçilik modellərinin təhsildə tətbiqi” kimi bir sıra təlim modullarının müəllifi olub.




2010-2014-cü illər ərzində Milli Qəhrəman Mübariz İbrahimov adına liseyin, 2014-2017-ci illərdə isə “İstək” liseylərinin direktoru vəzifəsində çalışıb. 2017-2022-ci illərdə Heydər Əliyev adına Müasir Təhsil Kompleksinin direktor müavini olub.

Finlandiya, Sinqapur, ABŞ və digər ölkələrdə təlim səfərlərində olub. Azərbaycan Respublikasının elm və təhsil nazirinin 1 dekabr 2022-ci il tarixli əmri ilə Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdir müavini vəzifəsinə təyin edilib.

## Ağcabədi filialında Müstəqillik Gününə həsr olunmuş tədbir keçirilib



ADPU-nun Ağcabədi filialında 28 May - Müstəqillik Günü münasibəti ilə “Azərbaycan Xalq Cümhuriyyəti Azərbaycan tarixinin şanlı səhifəsidir” mövzusunda tədbir keçirilib. Tədbirdə Ağcabədi Rayon İcra Hakimiyyəti Başçısının müavini, İctimai-siyasi və humanitar məsələlər üzrə şöbə müdiri Vüsalə Əliyeva, filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Tədbirə başlamazdan öncə Ümummilli Lider Heydər Əliyevin və ərazi bütövlüyümüz uğrunda canından keçən şəhidlərimizin müqəddəs ruhları bir dəqiqəlik sükutla yad edilib, Dövlət Himni səsləndirilib. Sonra Azərbaycanın dövlət müstəqilliyinin tarixinə həsr olunmuş videoçarx nümayiş etdirilib.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Mobil Məcidov milli istiqlal tariximizin şərəfli səhifəsi olan Azərbaycan Xalq Cümhuriyyətinin yaranma tarixindən danışıb. Qeyd edib ki, Cümhuriyyətin bolşeviklər tərəfindən devrilməsinə baxmayaraq, istiqlal duyğusu güclü olan Azərbaycan xalqı 1991-ci ildə sovet imperiyasının dağılması ilə yenidən öz müstəqilliyini elan etdi. Azərbaycan Respublikası müstəqilliyin ilk illərində böyük təhlükələrlə üzləşsə də, Ulu Öndər Heydər Əliyevin siyasi hakimiyyətə qayıdışı ilə ölkəmiz xilas olaraq, sabit inkişaf yoluna qədəm qoydu. "Azərbaycan Xalq Cümhuriyyəti Azərbaycan tarixinin şanlı səhifəsidir" mövzusunda məruzə edən filialın İctimai, təbiət fənləri və onların tədrisi texnologiyası kafedrasının baş müəllimi Araz Əliyev müsəlman Şərqində ilk dünyəvi demokratik dövlət olan Azərbaycan Xalq Cümhuriyyətinin yaranma tarixi, dövlətin daxili və xarici siyasəti, qısa zaman ərzində həyata keçirdiyi mühüm ictimai-siyasi əhəmiyyətli islahatlardan danışaraq, bu respublikanın azərbaycanlıların tarixi yaddaşında Azərbaycan dövlətçiliyinin ilk təcrübəsi kimi iz qoyduğunu xüsusilə vurğulayıb. O qeyd edib ki, Cümhuriyyət türk və islam dünyasında ilk parlamentli respublika və ilk demokratik, hüquqi və dünyəvi dövlət nümunəsi idi.

Məruzəçi çıxışını Ulu Öndər Heydər Əliyevin "Azərbaycan dövləti, müstəqil Azərbaycan Respublikası 1918-ci ildə yaranmış Xalq Cümhuriyyətinin varisidir" sözləri ilə yekunlaşdırıb.

Məruzədən sonra çıxış edən dosent Mahir Səlimov və dosent Yaqub Səmədov Azərbaycan xalqının dövlətçilik ənənələrindən söz açaraq Ümummilli Lider Heydər Əliyevin yeni tarixi mərhələdə qurub yaratdığı, müstəqilliyə qovuşdurduğu Azərbaycan Respublikasının indi Prezident İlham Əliyevin rəhbərliyi ilə sürətlə inkişaf etməsi, qarşıya qoyulan hədəflərə doğru inamla irəliləməsi, ümumbəşəri dəyərlərə əsaslanaraq mütərəqqi inkişaf kursu seçməklə böyük nailiyyətlərə imza atmasından fəxarət hissi ilə danışıblar.

## Pedaqoji Kollecin müəllim və tələbələri ADPU-da olub



Mayın 24-də ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) öz tələbə-müəllim heyəti ilə ADPU-nun qonağı olub.

Tədris departamentinin direktoru, dosent Sənan Əliyev və Elmi-təşkilati şöbənin müdiri, professor İbrahim Bayramov ADPK-nın heyəti və tələbələrlə görüşdükdən sonra, Kimya və biologiya fakültəsində qonaqlar üçün elmi seminar təşkil olunub.

Seminarda Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova, Kimya və biologiya fakültəsinin dekanı, dos. Reyhan Ağayeva qonaqları salamlayıb, ADPU-nun və fakültənin keçmişi və bu günü , "Yaşıl dünya naminə həmrəylik ili" və COP29-la bağlı icra olunan layihələr, keçirilən tədbirlər haqqında qonaqlara məlumat veriblər.

Daha sonra fakültənin dekan müavini, dos. Bəsti Əsədova, müəllim Zəminə Məlikova, eləcə də Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Həcər Hüseynova müxtəlif mövzularda təqdimatlarla çıxışlar ediblər.

Seminarda, həmçinin fakültənin dekan müavini, dos. Kərim Quliyev, ADPK-nın İnklüziv təhsil şöbəsinin müdiri Aygün Quliyeva, Məktəbəqədər təhsil şöbəsinin müdiri Mətanət İsmayılova, Tədris şöbəsinin tütoru Aidə Səttarova da təəssüratlarını bölüşüblər.

Seminardan sonra şöbə müdiri Könül Əsgərovanın müşayəti ilə qonaqlar universitetin iş fəaliyyəti, Heydər Əliyev Mərkəzi, elektron kitabxana və zooloji muzeylə tanış olub, Ümumi kimya və kimyanın tədrisi texnologiyası kafefrasının müəllimi Könül Əliyevanın hazırladığı maraqlı kimyəvi təcrübələri izləyiblər.

## 50 il sonra yenidən bir arada - ADPU-da məzunlarla görüş



Universitetin İbtidai təhsil fakültəsində 1974-cü ilin məzunları ilə 50 il sonra ilk dəfə görüş keçirilib.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himni ilə başlayıb. Giriş sözü ilə çıxış edən məzun Əlvi İbrahimov müzəffər Ali Baş Komandan İlham Əliyevin müdrik siyasəti və şanlı Azərbaycan Ordusunun qüdrəti ilə 2020-ci ildə 44 günlük Vətən müharibəsində və antiterror əməliyyatlarında Azərbaycan dövlətinin qazandığı qələbələrə diqqət çəkib.

ADPU-nun Tədris departamentinin Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova məzunları salamlayaraq onlara cansağlığı arzulayıb, universitetin qocaman məzunları ilə fəxr etdiyini bildirib.

Sonra çıxış edən məzunlardan Zeynəb Nəbiyeva, 152 nömrəli məktəbin keçmiş direktoru Sevil Bayramova və Nərgiz Namazova təəssüratlarını bölüşüblər.

Məzunlar belə tədbirlərin davamlı olmasını arzulayıb, bu kimi təşəbbüs və imkan üçün universitet rəhbərliyinə təşəkkürlərini ifadə ediblər.

Sonra xanım məzunlara güllər paylanılmış, məzunlar 50 il öncə dərs keçdikləri auditoriyalara yenidən daxil olaraq partalar arxasında əyləşmiş, müəllimlər simvolik dərslər keçmişlər.

## Pedaqoji Universitet elmi-tədqiqat institutları ilə əməkdaşlıq memorandumu imzalayıb



Mayın 27-də Pedaqoji Universitet ilə Elm və Təhsil Nazirliyinin Genetik Ehtiyatlar İnstitutu və Botanika İnstitutu arasında qarşılıqlı əməkdaşlıq haqqında memorandum imzalanıb.

Pedaqoji Universitetdə baş tutan imzalanma mərasimində ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Botanika İnstitutunun baş direktoru, professor Səyyarə İbadullayeva və Genetik Ehtiyatlar İnstitutunun baş direktoru, AMEA-nın müxbir üzvü Zeynal Əkbərov iştirak edib.

Sənədə əsasən tərəflər arasında müvafiq istiqamətlər üzrə münasibətlərin qurulması, tədrisin təkmilləşdirilməsi və inkişaf etdirilməsi və kadr hazırlığı sahəsində birgə əməkdaşlıq, elmi-tədqiqat üzrə birgə fəaliyyətin həyata keçirilməsi nəzərdə tutulur.

Mərasimdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov Pedaqoji Universitetin elmi-tədqiqat institutları ilə birgə elmi-pedaqoji və tədqiqat işlərinin aparılması, elmi kadrların hazırlanması, müasir tələblərə cavab verən dərsliklərin yazılması, elmi konfransların keçirilməsi və digər məsələlər üzrə gələcək əməkdaşlığının perspektivləri və zəruriliyini vurğulayıb. Daha sonra sənədlər imzalanıb.

İmzalanma mərasimində, həmçinin ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Kimya və biologiya fakültəsinin dekanı, dosent Reyhan Ağayeva, fakültənin dekan müavini, dosent Bəsti Əsədova və Botanika İnstitutunun İctimaiyyətlə əlaqələr şöbəsinin müdiri Məhsəti Qurbanova da iştirak edib.

## ADPU THİK intellektual yarış keçirib: Müstəqillik kuboku



ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) nəzdində fəaliyyət göstərən "Gənc İntellektlər" klubunun təşkilatçılığı ilə ADPU-nun əsas tədris binasında tələbələr arasında 28 May – Müstəqillik Gününə həsr olunmuş "Müstəqillik kuboku" adlı intellektual yarış keçirilib.

Yarışda universitetin 60-a yaxın tələbəsi 10 komanda halında mübarizə aparıb. Tələbələr Müstəqillik Günü ilə bağlı sualları cavablandırmağa çalışıblar.

Gərgin yarışın yekununda "5N1K" komandası yarışın qalibi, "OMADİ" komandası II, "SABAH" komandası isə III yerin sahibi olub.

Qalib komandaların üzvləri diplomla təltif olunublar.

## "Satira və yumor səhnədə" - ADPU tələbələri Tahir İmanovla görüşüb



Mayın 27-də Beynəlxalq Muğam Mərkəzində ADPU Tələbə Gənclər Təşkilatı (ADPU TGT) nəzdində fəaliyyət göstərən "CreArt" mədəniyyət klubunun təşkilatçılığı ilə Azərbaycan Respublikasının Əməkdar artisti, "Planet Parni İz Baku" KVN Teatrının bədii rəhbəri Tahir İmanovla "Satira və yumor səhnədə" adlı görüş keçirilib.

Açılış nitqi ilə çıxış edən ATGTİ-nin üzvlərlə iş üzrə meneceri, "CreART" proqramının rəhbəri Bəxtiyar Quluzadə Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin dəstəyi ilə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı tərəfindən yaradılmış "CreArt" mədəniyyət klublarının məqsədi və keçirdiyi layihələrlə bağlı ətraflı məlumat verib.

Daha sonra çıxış edən Pedaqoji Universitetin Tələbə Gənclər Təşkilatının (ADPU TGT) sədri Çiçək Sultanlı qeyd edib ki, belə görüşlərin təşkili tələbələrin asudə vaxtlarının səmərəli təşkilinə yönəlib və ADPU TGT gənclərin maarifləndirilməsi istiqamətində çoxsaylı tədbirlər həyata keçirir.

Daha sonra Əməkdar artist Tahir İmanov səhnəyə dəvət olunub. Tahir İmanov gənclərin suallarını cavablandırıb, "KVN"in tarixindən və şəxsi təcrübələrindən söz açıb.

## Pedaqoji Universitetdə yaz imtahan sessiyasına hazırlıq prosesi müzakirə olunub

Mayın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib.

İclası giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov əvvəlcə ötən dövrdə elmi adlar almış bir qrup əməkdaşa müvafiq diplomları təqdim edib. Tarix elmləri doktorları Namiq Niftiyev və Sevinc Əliyeva, eləcə də filologiya elmləri doktoru Sərdar Zeynalova professor attestatı, pedaqogika üzrə fəlsəfə doktoru Səidə Abdullayevaya isə dosent attestatı təqdim olunub. Daha sonra isə Respublika fənn olimpiadasında fərqlənən tələbələr mükafatlandırılıb.

Tədris departamentinin direktoru, dosent Sənan Əliyevin "ADPU-da 2023-2024-cü tədris ilinin yaz imtahan sessiyasına hazırlıq və qarşıda duran vəzifələr barədə" məruzəsindən sonra cari məsələlərin müzakirəsi aparılıb.

Elm innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov monoqrafiyaların çapa təqdim edilməsi və elmi məsləhətçinin dəyişdirilməsi barədə məruzə edib.



Rektorun müşaviri Ümid Mehdiyev Şura üzvlərinə ADPU-nun Şəki filialının monitorinqi ilə əlaqədar arayış təqdim edib. Sonda Tədris departamentinin direktoru, dosent Sənan Əliyev tədris-metodiki vəsaitlərin nəşrinə icazə verilməsi barədə məruzə edib.

Yekunda müzakirə olunan məsələlər ətrafında fikir mübadiləsi aparılıb, suallar cavablandırılıb və müvafiq qərarlar qəbul olunub.

## Qazi Universitetinin professoru Saleh Şahin ADPU-da olub



İyunun 5-də ADPU-da Qazi Universitetinin Təhsil fakültəsinin Coğrafiya təhsili departamentinin rəhbəri, professor Saleh Şahin ilə görüş keçirilib. Görüşdə Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, SABAH qrupları İcraya Komitəsinin rəhbəri Elza Səmədova, ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Asif Axundov, Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasının müdiri, dosent Oqtay Alxasov, Ümumi coğrafiya kafedrasının müdiri, professor Məhəmməd Abduyev və ADPU SABAH Mərkəzinin rəhbəri Lalə Mürsəlbəyova iştirak ediblər.

Görüşdə coğrafiya sahəsində mümkün əməkdaşlıq imkanları ilə bağlı müzakirələr aparılıb və əməkdaşlığın qarşılıqlı faydalı olacağı vurğulanıb.

Daha sonra Elm və Ali Təhsil üzrə Dövlət Agentliyi, SABAH qrupları və Pedaqoji Universitetin birgə təşkilatçılığı ilə professor Saleh Şahin ADPU və BDU-nun coğrafiyaçı professor-müəllim heyəti və son tədris ilinin tələbələri üçün "Coğrafiya tədrisinin müasir texnologiyaları" mövzusunda praktiki təlim keçib.

Əvvəlcə, rektor Cəfər Cəfərov və SABAH qrupları İcraya Komitəsinin rəhbəri Elza Səmədova qonağı iştirakçılara təqdim edib, bu tip təlimlərin önəmindən bəhs ediblər.

Təlimdə müasir dövrdə coğrafi təhsilin mahiyyəti, dərs prosesinin qurulması texnologiyaları və coğrafiya dərslərində texnoloji vasitələrin və yenilikçi öyrətmə üsulların tətbiqi məsələlərinə toxunulub.

İnteraktiv formatda keçən təlimdə fərqlənən iştirakçılara coğrafiyaya aid kitablar hədiyyə olunub.

Yekunda prof. S.Şahinə ADPU rəhbərliyi adından təşəkkürnamə təqdim olunub.

## ADPU tələbələri DOST İnklüziv İnkişaf və Yaradıcılıq Mərkəzində olublar

Kimya və biologiya fakültəsinin dekan müavini, dosent Bəsti Əsədovanın rəhbərliyi, müəllimlər Zəminə Məlikova, Sevinc Mehdiyeva və fakültənin mətbuat katibi Gültəkin Ərəbovanın iştirakı ilə fakültənin III tədris ilinin tələbələri DOST İnklüziv İnkişaf və Yaradıcılıq Mərkəzində olublar.

Mərkəzin sosial işlər üzrə mütəxəssisi Aysel İsmayılova müəllim-tələbə heyətini mərkəzin fəaliyyəti barədə məlumatlandırıb, həssas əhali qruplarına aid şəxslərə göstərilən xidmət istiqamətləri ilə tanış edib. Qeyd olunub ki, mərkəzdə həssas qrupdan olan şəxslərin yaradıcılıq potensialının artırılması və sosial-psixoloji dəstək məqsədi ilə rəqs, təsviri incəsənət, dulusçuluq, musiqi, dərzilik, modelyerlik, xalçaçılıq, toxuma və tikmə, bədii oyma, floristika, bağçılıq və landşaft dizaynı, audio-səsyazma və media, fotoqrafiya sənəti, kulinariya, səhnə ifaçılığı, kapoeyra və publisistika daxil olmaqla, ümumilikdə 14 istiqamət üzrə təlimlər keçirilir.




Ekskursiya çərçivəsində tələbələr mərkəzdə benefisiarların hazırladıqları əl işlərindən ibarət sərgi ilə, o cümlədən göstərilən xidmət istiqamətləri üzrə studiya və təlim otaqları, burada müəllim və benefisiarların gördükləri işlər, mərkəzin kitabxana və akt zalı ilə tanış olmuşlar.

## Şamaxı filialında Abbas Səhhətin 150 illiyinə həsr olunmuş Respublika elmi konfransı keçirilib



ADPU-nun Şamaxı filialında görkəmli şair və maarif xadimi Abbas Səhhətin 150 illiyinə həsr olunmuş "Vətəni sevməyən insan olmaz!" Respublika elmi konfransı keçirilib.

Konfransdan əvvəl adibin Şamaxı rayonunda yerləşən abidəsi ziyarət olunub. Filialda keçirilən plenar iclasda, əvvəlcə, Abbas Səhhətə həsr olunmuş videoçarx nümayiş olunub. Filialın direktoru, dosent Tünzalə Yusifova giriş sözü ilə çıxış edərək qeyd edib ki, xalqımızı yaşadan, irəli aparan saysız görkəmli şəxsiyyətlər olmuşdur. Belə görkəmli şəxsiyyətlərdən biri də Abbas Səhhətdir. Ulu Öndər Heydər Əliyev ideyalarının uğurlu davamçısı olan cənab Prezident İlham Əliyev hər zaman xalqımızın bu cür dəyərli ziyalılarına dəyər verir və onların yubileylərinin təntənəli surətdə qeyd edilməsi ilə bağlı sərəncamlar imzalayır. Bu il cənab Prezident İlham Əliyev tərəfindən Abbas Səhhətin 150 illik yubileyinin qeyd edilməsi ilə bağlı Sərəncam imzalanıb. Sonra ADPU-nun Azərbaycan ədəbiyyatı kafedrasının professoru Təyyar Cavadovun "Abbas Səhhət: tərcümeyi halından yaradıcılığının fəlsəfəsinə qədər", ADPU-nun Azərbaycan ədəbiyyatı kafedrasının dosenti Qüdrət Umudovun "Abbas Səhhət poeziyasında vətən təbiətinin təsvir və tərənnümü" mövzusunda çıxışları dinlənilib. Plenar iclasın ardınca konfrans Ədəbiyyatşünaslıq, Dilçilik və onun aktual problemləri, Tarix və coğrafiya elmləri, Pedaqogika və psixologiya elmləri və Təbiət elmləri bölmələrində davam etdirib. Hibrid formada keçirilən Respublika elmi konfransında həm onlayn, həm də əyanı məruzələr dinlənilib.

## Pedaqoji Universitetdə yaz imtahan sessiyasına start verilib



İyunun 3-də ADPU-da 2023/2024-cü tədris ilinin yaz imtahan sessiyasına start verilib. Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov imtahan prosesinin gedişini izləyib, eləcə də İmtahan Qərargahı və Apellyasiya Komissiyasının fəaliyyəti ilə tanış olub.

Qeyd edək ki, ay ərzində davam edən imtahan sessiyasında tələbələr əsasən yazılı, eyni zamanda şifahi formada imtahanlarda iştirak edirlər.

## Pedaqoji Universitetin 812 tələbəsi magistraturaya qəbul imtahanlarında iştirak edib




2023-2024-cü tədris ilində Pedaqoji Universitetin bakalavr proqramlarından məzun olması proqnozlaşdırılan 2410 tələbədən 812 nəfəri (34 %) cari il üçün magistraturaya qəbul imtahanlarında iştirak edərək, müvafiq keçid balından yüksək nəticə göstərərək magistraturaya ixtisas seçimi mərhələsində iştirak etmək hüququ qazanıblar. Qeyd edək ki, ötən il analoji rəqəm 385 nəfər olub.

Eyni zamanda, cari ildə ADPU-nun 54 nəfər sonuncu tədris ili tələbəsi xarici ölkələrin ali təhsil müəssisələrinin magistraturalarına sənəd təqdim ediblər (bu göstəricinin artacağı proqnozlaşdırılır).

## ADPU-nun Elmi-Tədqiqat Mərkəzi tərəfindən növbəti təlim keçirilib

İyunun 4-də ADPU-nun Elmi-Tədqiqat Mərkəzi (ADPU ETM) tərəfindən İncəsənət və fiziki tərbiyə fakültəsində professor-müəllim heyəti üçün "Pedaqoji təhsildə müasir təlim texnologiyalarının tətbiqi: beynəlxalq təcrübə və mentor xidmətinin təşkili" layihəsi çərçivəsində bir günlük təlim keçirilib.

Təlimdən əvvəl fakültədə keçirilən dəyirmi masada layihənin icrasına dair fikir mübadiləsi aparılıb. Dəyirmi masada ETM-in müdiri, dosent Ərəstun Mehdiyev, Tətbiqi tədqiqatlar bölməsinin müdiri, dosent Gülşən Novruzova, İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı, dosent Anar Fərmayılov, dekan müavini Jalə Təhməzova, kafedra müdirləri dosent Nigar Cəlilova və Telman Tağıyev iştirak edibər.

Layihə çərçivəsində fakültədə tədris sahəsində mövcud vəziyyət öyrənilərək müzakirə edilib və fəaliyyət planı üzrə qarşıda duran vəzifələr icra olunub. Müəllim və tələbələr arasında sorğular aparılıb, dərs müşahidələri və sillabusların təhlili həyata keçirilib, nəticələrə dair müzakirələrdən sonra təlimlər təşkil edilib. Tətbiqi tədqiqatlar bölməsinin müdiri, dos. Gülşən Novruzovanın təqdimatında keçirilən təlimin məqsədi



professor-müəllim heyətinin tədqiqata əsaslanan dərslərin təşkilinə yönəldilməsi və praktik bacarıqlarının təkmilləşdirilməsi, eyni zamanda qabaqcıl beynəlxalq təcrübənin (Türkiyə) tətbiq edilməsindən ibarətdir.

Təlimlərin yekununda iştirakçılara sertifikatlar təqdim edilməsi planlaşdırılır.

Ümumilikdə ADPU-nun SABAH qruplarında bakalavriatura üzrə "Korreksiyaedici təlim" və "Məktəbəqədər təhsil" ixtisasları ilə birgə 3 ixtisasda kadr hazırlığı aparılacaq. Magistratura səviyyəsində isə "Təlim və tədrisin təşkili və metodikası (SABAH)" ixtisaslaşması ilə birgə 3 ixtisaslaşmada SABAH magistratura proqramı icra olunacaq.

Pedaqoji Universitetin 2024-2025-ci tədris ili üçün qəbul planında da artım var. Belə ki, ötən ilə nisbətən qəbul planı bakalavriat səviyyəsi üzrə 2570-nəfərdən 2655-ə (Azərbaycan bölməsi üzrə 2265, rus bölməsi üzrə 270, ingilis bölməsi üzrə isə 120 plan yeri), magistratura səviyyəsində isə 443-dən 499 nəfərə qaldırılıb.

## ADPU-da Qarabağ Universitetinin SABAH qruplarına qəbulla bağlı infosessiya keçirilib

İyunun 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Qarabağ Universitetinin SABAH qruplarının 2024/2025-ci tədris ili üzrə bakalavriatura səviyyəsinə tələbə qəbulu ilə bağlı infosessiya keçirilib.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Qarabağda yaradılan ilk ali təhsil ocağına dəstək olmaq hər birimizin borcudur. Eyni zamanda tələbələri burada yaradılan mükəmməl təhsil mühiti və sosial həyat barədə məlumatlandırmaq baxımından bu kimi tədbirlərin önəmi qeyd olunub.

Qarabağ Universitetinin rektoru Şahin Bayramov SABAH qruplarının Elm və Təhsil Nazirliyinin ən uğurlu layihələrindən biri olduğunu və Azərbaycan ali təhsili üçün dəyər olduğunu qeyd edərək Qarabağ Universitetinin SABAH qruplarında tələbələrə yaradılacaq imkanlar barədə danışıb. Bildirilib ki, Qarabağ Universitetinin SABAH qruplarında təhsil alan hər bir tələbə ödənişli, yaxud dövlət sifarişi ilə qəbul olunmasından asılı olmayaraq dövlət hesabına təhsilini davam etdirəcək, ödənişsiz mənzil tipli yataqxana ilə təmin olunacaq, hər bir tələbəyə kompüter hədiyyə olunacaq və onlar əlavə təqaüd imkanlarından yararlanacaqlar.



İnfosessiyada SABAH qrupları İcra Komitəsinin rəhbəri Elza Səmədova tələbə qəbulu qaydaları, seçim mərhələləri haqqında ətraflı məlumat verib.

Qarabağ Universitetinin Pedaqoji fakültəsinin dekanı Kəklik Gözəlova və İncəsənət fakültəsinin dekanı Türkər Qasımzadə SABAH qruplarının üstünlükləri, eyni zamanda fakültələrdə kadr hazırlığı aparılacaq ixtisaslarla bağlı tələbələri məlumatlandırıb, onların suallarını cavablandırıblar.

## Pedaqoji Universitet Biruni Universiteti ilə müqavilə imzalayıb




Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Türkiyənin Biruni Universiteti ilə ikitərəfli və "Global Exchange" mübadilə proqramı çərçivəsində müqavilə imzalıyıb.

Müqaviləyə əsasən, Riyaziyyat müəllimliyi, Xarici dil müəllimliyi, məktəbəqədər təhsil, ibtidai təhsil və xüsusi təhsil sahəsində universitetlər arasında "Global Exchange" mübadilə proqramı çərçivəsində tələbə-müəllim mübadiləsi həyata keçiriləcək.

## Pedaqoji Universitetdə yeni bakalavr və magistr ixtisasları açılıb

BAKALAVRİAT
- FİLOLOGİYA (AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYATI)
- TARİX VƏ COĞRAFİYA MÜƏLLİMLİYİ (SABAH)

MAGİSTRATURA
- TƏHSİLDƏ QİYMƏTLƏNDİRMƏ VƏ MONİTORİNQ (SABAH)
- MENECMENT (ALİ TƏHSİLİN TƏŞKİLİ VƏ İDARƏ OLUNMASI) (SABAH)

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 2024-2025-ci tədris ili üçün qəbul planı təsdiqlənib.

Artıq Pedaqoji Universiteti seçən tələbələr bakalavriat və magistratura səviyyələrində yeni açılan ixtisaslarda da təhsil ala biləcəklər. Belə ki, ADPU-da bakalavriat səviyyəsində yeni tədris ilindən "Filologiya (Azərbaycan dili və ədəbiyyatı)" ixtisası üzrə qəbul həyata keçiriləcək. Bununla da bakalavriat səviyyəsi üzrə ixtisasların sayı 25-ə çatmış olacaq. Eyni zamanda növbəti tədris ilindən universitetdə "Tarix və coğrafiya müəllimliyi" ixtisası üzrə SABAH qruplarına da qəbul aparılacaq.

Magistratura səviyyəsi üzrə isə Təhsildə qiymətləndirmə və monitorinq (SABAH) və "Menecment (Ali təhsilin təşkili və idarə olunması)" (SABAH) ixtisaslaşmalarına ilk qəbul aparılacaq və beləliklə, Pedaqoji Universitetdə magistratura səviyyəsində 22 ixtisas üzrə 30 ixtisaslaşmada yüksək keyfiyyətli mütəxəssis hazırlığı həyata keçiriləcək.

## "Milli ideya və müasir fəlsəfənin inkişaf yolları" mövzusunda dəyirmi masa



İyunun 7-də ADPU-da Azərbaycan Milli Elmlər Akademiyası Fəlsəfə və Sosiologiya İnstitutu ilə birgə "Milli ideya və müasir fəlsəfənin inkişaf yolları" mövzusunda dəyirmi masa keçirilib.

Dəyirmi masanı açan moderator, ADPU-nun Fəlsəfə və sosial elmlər kafedrasının müdiri, professor Rafail Əhmədli qeyd edib ki, dəyirmi masa Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qeyd etdiyi "Mən istərdim ki, cəmiyyətdə də bu məsələ ilə bağlı diskussiyalar getsin, siyasətçilər, politoloqlar, elm adamları, ziyalılar, yəni bizim gələcək inkişafımızla bağlı əsas milli ideya və ideyalarımız nə olmalıdır. Bu, bir ictimai müzakirə mövzusu olmalıdır." - fikirlərinə əsasən müzakirələrin aparılması və bu istiqamətdə perspektiv fəaliyyətlərin müəyyənləşdirilməsi məqsədi ilə keçirilir.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru prof. Cəfər Cəfərov bildirib ki, milli ideologiyanın yeni dövrün tələblərinə uyğunlaşdırılması və bu prosesdə elmi-pedaqoji ictimaiyyətin iştirak etməsi olduqca vacib məsələdir.

AMEA-nın Fəlsəfə və Sosiologiya İnstitutunun direktoru, prof. İlham Məmmədzadə isə çıxışında bildirib ki, milli ideya və milli ideologiya, şüur, özünüdərk, eləcə də milli siyasət və fəlsəfə tarixi kimi anlayışlara yenidən baxılmalı, bu istiqamətdə ölkə rəhbərliyinin tövsiyələrini nəzərə alaraq, o cümlədən dəyişən dünyanın tələbləri çərçivəsində fundamental tətqiqatlar aparılmalı və daha təkmil forma yaradılmalıdır.

Daha sonra Fəlsəfə və Sosiologiya İnstitutunun şöbə müdiri, prof. Fizuli Qurbanov və prof. Rəna Mirzəzadə, eləcə də ADPU-nun Fəlsəfə və sosial elmlər kafedrasının professoru Əyyub Kərimov və dosentləri Paşa Quluzadə və Elşən Bayramzadə mövzu ətrafında çıxış edib, səslənən fikirlər ətrafında müzakirələr aparılıb.

## ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin yeni xanım sədri Səidə Abdulova



Bu yaxınlarda ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) sədrliyinə keçirilən seçkilərdə Səidə Abulova təşkilata yeni sədr seçilib.

Səidə Abulova 8 iyun 2004-cü ildə İsmayıllı rayonunda doğulub. 2021-ci ildə orta məktəbi bitirərək Azərbaycan Dövlət Pedaqoji Universitetinin İbtidai təhsil fakültəsinin İbtidai sinif müəllimliyi ixtisasına qəbul olunub. 2022-ci ildən təhsilini SABAH qruplarında davam etdirir. Hazırda III tədris ilinin tələbəsidir.

İlk dəfə I kursda oxuyarkən ADPU Könüllüləri Təşkilatında menecer kimi ictimai fəaliyyətə başlayan Səidə qısa müddətdə aktiv fəaliyyəti ilə fərqlənərək təşkilatda fakültə rəhbərinin müavini vəzifəsini tutub.

2022-ci ildən ADPU Təhsil Könüllüləri Tələbə Birliyində mətbuat katibi, 2023-cü ildən isə təşkilatın sədr köməkçisi vəzifəsində fəaliyyət göstərib.

2024-cü ilin 24 mayında keçirilən Hesebat-seçki yığıncağında ADPU TKTB-yə yeni sədr seçilib. Xatırladaq ki, təşkilatın bundan əvvəlki 4 sədrindən 3-ü də xanım tələbələr olub.

## ADPU TGT sədri Çiçək Sultanlını yaxından tanıyaq



Pedaqoji Universitetin Tələbə Gənclər Təşkilatına yeni sədr seçilən Çiçək Maarif qızı Sultanlı 19 may 2004-cü ildə Bakı şəhərində anadan olub. 2021-ci ildə Binə qəsəbəsi, Elçin Şəmiyev adına 149 nömrəli məktəbi fərqlənmə ilə bitirib. Həmin il Azərbaycan Dövlət Pedaqoji Universitetinin Riyaziyyat fakültəsinin "Riyaziyyat və informatika müəllimliyi" ixtisasına qəbul olunub. Hazırda III tədris ilinin tələbəsidir.

Universitetdə ADPU TGT-də menecer olaraq ictimai fəaliyyətə başlayan Çiçək 2023-ci ilin mart-oktyabr aylarında Riyaziyyat fakültəsi üzrə TGT sədr əvəzedicisi vəzifəsini yerinə yetirib. Daha sonra isə ADPU TGT-nin sədr müavini vəzifəsində fəaliyyət göstərib.

2022-2023-cü illərdə ADPU TGT-də göstərdiyi uğurlu fəaliyyətinə görə diplomla, 2023-cü il ərzində Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının fəaliyyətinə verdiyi töhfəyə görə "İlin TGT fəalı" adı ilə, universitetin sosial-ictimai həyatında fəal iştirakına görə isə "Fəxri Fərman"la təltif olunub.

## Qazi Universitetinin nümayəndə heyəti ilə görüş



Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyənin Qazi Universitetinin nümayəndə heyəti ilə görüş keçirilib.

Görüşdə Qazi Universitetinin tələbələrlə iş üzrə prorektoru, professor Yücel Gəlişli, Təhsil fakültəsinin dekanı, professor Mahmud Səlvi, ADPU-dan isə universitetin rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, strateji inkişaf məsələləri üzrə prorektor Könül Pirverdiyeva, Tədris departamentinin direktoru, dosent Sənan Əliyev və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova iştirak ediblər. 3ADPU və Qazi Universiteti arasında əlaqələrin genişləndirilməsi ilə bağlı müzakirələr zamanı bir neçə əsas məqamlar vurğulanıb. Görüşdə təhsil sahəsində əməkdaşlığın inkişaf etdirilməsi, tələbə və müəllim mübadiləsi, ortaq elmi tədqiqatların aparılması, konfrans və seminarların təşkili, akademik proqramların uyğunlaşdırılması kimi məsələlər ətrafında fikir mübadiləsi aparılıb.

Professor Cəfər Cəfərov universitetlər arasında mövcud əlaqələrin daha da möhkəmləndirilməsinin vacibliyini qeyd edib və bu istiqamətdə atılacaq addımların ADPU tərəfindən dəstəklənəcəyini bildirib. O, həmçinin, hər iki universitetin akademik potensialından səmərəli istifadə etməklə təhsil keyfiyyətinin artırılmasının önəmini vurğulayıb.

Qazi Universitetinin tələbələrlə iş üzrə prorektoru, prof. Yücel Gəlişli iki qardaş ölkə arasında təhsil sahəsində mövcud olan tarixi əlaqələrə toxunaraq, bu əməkdaşlığın gələcəkdə daha da genişlənməsi üçün potensialın olduğunu bildirib. Universitetin Təhsil fakültəsinin dekanı, prof. Mahmud Səlvi də bu əməkdaşlığın hər iki universitetin akademik və elmi inkişafına mühüm töhfə verəcəyini ifadə edib.

Görüşdən sonra qonaqlar Pedaqoji Universitetin tədris binası ilə tanış olaraq, burada fəaliyyət göstərən Qərbi Azərbaycan Araşdırmalar Mərkəzi, Türksoy kafedrası, Türkoloji Mərkəz, Heydər Əliyev Mərkəzi və elektron kitabxanada olub, həmçinin yeni açılmış "Dil və ədəbiyyat müəllimliyi" (türk dili üzrə) ixtisasının tələbələri ilə görüşüblər.

## Professor Mahirə Hüseynova Turan Elmlər Akademiyasının akademiki seçilib



ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova Turan Elmlər Akademiyasının akademiki seçilib.

Universitetdə təşkil olunan görüş zamanı AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun Mətbuat tarixi və publisistika şöbəsinin müdiri, professor Vüqar Əhməd professor Mahirə Hüseynovanın monoqrafiyalarının, dərs vəsaitlərinin Turan Elmlər Akademiyasının bütün üzvləri tərəfindən təqdir olunduğunu və yekdilliklə ona səs verildiyini bildirib.

Professor Vüqar Əhməd Turan Elmlər Akademiyasının prezidenti, Leybniz adına Avropa Təbiət Elmləri Akademiyasının həqiqi üzvü (Almaniya) Xaydarberk Bababekovun professor Mahirə Hüseynovaya ünvanladığı təbrik məktubunu da səsləndirib.

Professor Mahirə Hüseynova göstərilən etimada görə Turan Elmlər Akademiyasının prezidentinə və bütün üzvlərinə təşəkkürünü bildirib, Azərbaycan-Özbəkistan dostluq münasibətlərinin inkişafının vacibliyini qeyd edib.

## Milli Qurtuluş Gününə həsr olunmuş tədbir: Qurtuluşdan Zəfərə



İyunun 13-də ADPU-nun Heydər Əliyev Mərkəzində "Qurtuluşdan Zəfərə" adlı tədbir keçirilib. Milli Qurtuluş Gününə həsr olunmuş tədbirdə universitet rəhbərliyi, fakültə dekanları, şöbə, mərkəz və kafedra müdirləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Heydər Əliyev Mərkəzinin əməkdaşı Tərlan Ağayevin moderatorluğu ilə keçirilən tədbir Ulu Öndər Heydər Əliyevin və ölkəmizin suverenliyi, ərazi bütövlüyü uğrunda şəhid olmuş həmvətənlərimizin xatirəsinin yad edilməsi ilə başlayıb, ardınca Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Giriş nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qeyd edib ki, 15 İyun xalqımız üçün əsl qurtuluş tarixidir. Bu qurtuluşu mümkün edən əsas amil müstəqilliyimizin qorunub saxlanmasında və möhkəmlənməsində müstəsna xidmətlər göstərmiş Ümummilli Lider Heydər Əliyevin şəxsiyyəti və titanik fəaliyyətidir. Son 30 ildə bütün sahələrdə qazanılan uğurların təməlində Ümummilli Liderin müəyyənləşdirdiyi siyasi kurs və Prezident İlham Əliyevin bu kursu yeni şəraitdə yüksək səviyyədə davam etdirməsi kimi mühüm faktorlar dayanır.

Natiq bildirib ki, Ulu Öndərin ən böyük arzularından biri işğal altındakı torpaqlarımızın azad olunması, ərazi bütövlüyümüzün bərpa edilməsi idi. 44 günlük Vətən müharibəsindəki möhtəşəm qələbə, 24 saatdan az çəkən antiterror əməliyyatı, bu ilin mayında Qazax rayonunun işğal altındakı 4 kəndinin bir güllə belə atılmadan geri qaytarılması Heydər Əliyevin ən böyük arzusunu tam reallığa çevirərək, Azərbaycanın çoxəsrlik tarixində misli görünməmiş hadisələr oldu.

Giriş nitqindən sonra tədbir iştirakçıları Heydər Əliyevə həsr olunmuş sənədli filmə tamaşa ediblər, ardınca ADPU-nun Tarix və coğrafiya fakültəsinin dekan müavini, f.ü.f.d Paşa Quluzadə "Heydər Əliyev düşüncəsində azərbaycançılıq məfkurəsi" mövzusunda məruzə ilə çıxış edib.

Ekranda ADPU tələbələri tərəfindən Ulu Öndərə itfahən hazırlanmış videoçarxın nümayişindən sonra Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının müəllimi, ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının sədri İlkin Əsgərovun "Azərbaycan dili və ədəbiyyatının inkişafı məsələləri Ulu Öndərin diqqət mərkəzində" mövzusundakı məruzəsi dinlənilib.

"Meh" ədəbi dərnəyinin üzvü, ADPU-nun Kimya və biologiya fakültəsinin tələbəsi Şəbnəm Həmidovanın ifasında Xalq şairi Zəlimxan Yaqubun "Sənin adın gələndə" şeirinin səsləndirilməsindən sonra Pedaqoji Universitetin tələbələri adından söz alan ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin sədri Səidə Abulova "Heydər Əliyev müstəqil Azərbaycanda gənclər siyasətinin banisidir" mövzusunda çıxış edib.

Tədbir müğənni Almaz Ələsgərlinin ifasında "Ulu Öndər" mahnısının ekranda nümayişi ilə yekunlaşıb.

## Pedaqoji internatura nəticələrinin qiymətləndirilməsinə başlanılıb



İyunun 13-də universitetdə pedaqoji internaturanın yekun hesabatlarının qiymətləndirilməsi prosesinə start verilib.

İlk qiymətləndirmə iclaslarında ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, rektorun müşaviri Ümid Mehdiyev, Tədris departamentinin müdiri dosent Sənan Əliyev, Pedaqoji təcrübə rəhbəri Qəmərxanım Qəribova, eləcə də müəviq olaraq pedaqoji internaturada iştirak edən pedaqoq və psixoloqlar iştirak ediblər.

Qiymətləndirmələrdə tələbələr internatura müddətində ümumtəhsil məktəblərində göstərdikləri fəaliyyətlər haqqında hesabatlarını təqdim edib, sualları cavablandırıblar.

Qeyd edək ki, iyulun 2-dək davam edəcək prosesdə, ümumilikdə, 19 ixtisas üzrə 2000 nəfərdən çox tələbə iştirak edəcək.

## Heydər Əliyevin 101 illiyi münasibəti ilə keçirilən olimpiada və müsabiqə qalibləri mükafatlandırılıb



İyunun 13-də ADPU-da Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101 illiyi münasibəti ilə universitet tələbələri arasında keçirilən olimpiadalar və müsabiqənin qaliblərinin mükafatlandırılması mərasimi keçirilib.

Mərasimdə Pedaqoji Universitetin rəhbərliyi, müvafiq struktur bölmələrin rəhbərləri və müvəffəqiyyət qazanan tələbələr iştirak ediblər.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov olimpiadalar və müsabiqədə iştirak edərək uğur qazanan tələbələri təbrik edib, tələbələr arasında elmi tədqiqatçılıq bacarıqlarının təşviq olunmasının, stimullaşdırıcı tədbirlərin önəmini qeyd edib.

Çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamnov qeyd edib ki, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101 illiyi münasibəti ilə universitet tələbələri arasında keçirilən riyaziyyat, informatika, fizika, kimya, biologiya, Azərbaycan dili, Azərbaycan ədəbiyyatı, Azərbaycan tarixi, Azərbaycan coğrafiyası və ingilis dilindən olimpiadalar və təsviri incəsənətdən müsabiqənin fakültə mərhələsində uğur qazanan 100 nəfərədək tələbə may ayının 16-da II mərhələ üzrə imtahanlarda iştirak edib və nəticələrə əsasən hər bir sahə üzrə I, II və III yer tutan tələbələr müəyyənləşdirilib.

Elmi-təşkilati şöbənin müdiri, professor İbrahim Bayramov olimpidalar və müsabiqəyə böyük marağın olduğunu, müvafiq yerləri tutan tələbələrə diplomlarla yanaşı pul mükafatının da təqdim olunacağını diqqətə çatdırıb.

Daha sonra uğur qazanan tələbələrə müvafiq dərəcəli diplomlar və mükafat təqdim olunub.

## Pedaqoji Universitetin ABŞ-nin Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramının III məzun buraxılışı keçirilib

İyunun 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Amerika Birləşmiş Ştatlarının (ABŞ) nüfuzlu universitetlərindən Corc Vaşinqton Universiteti (CVU) ilə birgə ikili diplom magistr proqramının üçüncü məzun buraxılışı keçirilib. Mərasimdə Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayev, CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı Maykl Foyer və məktəbin professoru Kolin Qrin, habelə Elm və Təhsil Nazirliyinin və Dövlət Neft Fondunun məsul əməkdaşları, ADPU və Corc Vaşinqton Universitetinin nümayəndələri və proqramın məzunları iştirak ediblər.

CVU-nun proqram direktoru Sevinc Məmmədovanın moderatorluğu ilə keçirilən mərasimdə, əvvəlcə, təntənəli məzun himninin sədaları altında universitetlərin bayraqları səhnəyə gətirilib və proqramın müəllim və tələbələri zala daxil olublar.

Açılış nitqi söyləyən Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov proqramın növbəti məzunlarını təbrik edib, onlara uğurlar arzulayıb.

Rektor qeyd edib ki, bu gün ikili diplom proqramından 42 nəfər məzun olur. Öncəki iki ildə proqramın məzunu olmuş 41 məzunu da nəzərə alsaq, ümumilikdə onların sayı artıq 83 nəfər təşkil edir.

Prof. C.Cəfərov məzunların təhsil siyasəti və idarəetməsi sahəsində qazandıqları biliklər və formalaşdırdıqları bacarıqların onları gələcəyin liderləri, yenilikçiləri və dəyişikliklər yaradacaq şəxsləri kimi hazırladığını vurğulayaraq deyib: "İnanıram ki, sizlər ölkəmizin təhsil sisteminin inkişafında və təkmilləşməsində fəal rol oynayacaq, gənc nəsillərin daha yaxşı təhsil alması üçün çalışacaqsınız".

CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı Maykl Foyer çıxış edərək proqramın məzunlarını təbrik edib, onların təhsilin inkişafında fərq və dönüş yaradacaq liderlər kimi özlərini göstərəcəklərinə inamını ifadə edib.

İkili diplom proqramında tədrisin təşkili və tələbələrin fəaliyyəti ilə bağlı videoçarxın nümayiş olunmasından sonra çıxış edən Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayev diqqətə çatdırıb ki, bu proqram ölkəmizin təhsil sistemində mühüm bir yeniliyin təməlini qoyub. Azərbaycan və ABŞ arasında akademik əlaqələrin inkişafı, təhsil sahəsində



mübadilə və əməkdaşlıq imkanlarının genişləndirilməsi istiqamətində atılan bu addım gələcəyin təhsil liderlərini hazırlamaq məqsədi daşıyır. Bugünkü məzunlar bu əməkdaşlığın uğurlu nəticələrindəndir və sizlərin əldə etdiyiniz bilik və bacarıqlar Azərbaycan təhsil sisteminin inkişafında böyük rol oynayacaq.

Proqramın Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə icra olunan "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" əsasında həyata keçirildiyini vurğulayan nazir bu baxımdan, bu kimi fəaliyyətlərin ölkə rəhbərliyinin təhsilin inkişafına dəstəyi və diqqətinin bariz nümunəsi olduğunu diqqətə çatdırıb.

Daha sonra CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı Maykl Foyer və proqram direktoru Sevinc Məmmədova "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi (1921-2021)" yubiley medalı ilə təltif olunublar.

Sonda "Təhsil siyasəti və idarəetməsi" üzrə ADPU-CVU birgə ikili diplom magistr proqramının 2022-2023-cü tədris ili məzunlarına fəxri diplomlar təqdim olunub. Qeyd edək ki, Pedaqoji Universitetin Corc Vaşinqton Universiteti ilə "Təhsil siyasəti və idarəetməsi" üzrə birgə ikili diplom magistr proqramı Elm və Təhsil Nazirliyi, Dövlət Neft Fondu və Dövlət proqramlarının idarəetmə qrupunun dəstəyi ilə həyata keçirilir.

## "Xəzinədir, tullantı deyil!" – ADPU-nun təhsil könüllülərindən maraqlı layihə



ADPU Təhsil Könüllüləri Tələbə Birliyi (ADPU TKTB) tərəfindən "Yaşıl dünya naminə həmrəylik ili" və 2024-cü ilin sonunda ölkəmizdə keçiriləcək COP29 tədbirinə həsr olunmuş "Xəzinədir, tullantı deyil!" adlı layihə keçirilib.

Layihə çərçivəsində tələbələr açıq hava altında lazımsız hesab edilən tullantılardan müxtəlif əl işləri hazırlayıblar. Eyni zamanda asudə vaxtlarını səmərəli keçirərək, musiqi müşayiəti ilə yaradıcılıq qabiliyyətlərini sərgiləyiblər.

Layihə ətraf mühitə hörmətlə yanaşmaq, təbiətə olan qayğının artırılması, yaradıcı potensialı artırmaq və tələbə birliyi üzvləri arasında həmrəyliyi dəstəkləmək məqsədilə həyata keçirilib.

## ADPU-nun SABAH magistraturalarını seçmək üçün 1334 nəfər müsahibə verib




Pedaqoji Universitetin SABAH magistratura ixtisaslaşmalarını seçmək üçün 1334 nəfər müsahibələrdə iştirak edib. Onlardan 1114 nəfəri müsahibədən məqbul cavab alaraq ADPU-nun SABAH magistratura ixtisaslaşmalarını seçmək şansı əldə ediblər.

Qeyd edək ki, ADPU-da SABAH magistratura üzrə 3 ixtisaslaşmada qəbul həyata keçirilir:

- Təlim və tədrisin təşkili və metodikası (SABAH)
- Təhsildə qiymətləndirmə və monitorinq (SABAH)
- Menecment (Ali təhsilin təşkili və idarə olunması) (SABAH)

ADPU-da magistratura səviyyəsində, ümumilikdə, 30 ixtisaslaşma üzrə qəbul həyata keçirilir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## Pedaqoji Universitet və Corc Vaşinqton Universiteti arasında Niyyət Bəyannaməsi imzalanıb



İyunun 23-də "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və ABŞ-nin tanınmış universitetlərindən Corc Vaşinqton Universiteti arasında həyata keçirilən "Təhsil siyasəti və idarəetməsi" üzrə magistr ikili diplom proqramının Rəhbər Komitəsinin iclası keçirilib.

İclasda Azərbaycan Respublikasının elm və təhsil nazirinin müşaviri Nicat Məmmədli, Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, Dövlət Proqramı İdarəetmə Qrupunun rəhbəri Turan Topalova, CVU-nun Təhsil və İnsan İnkişafı Məktəbinin dekanı Maykl Foyer, məktəbin professoru Kolin Qrin və dosenti Maria Cseh, CVU-nun proqram direktoru Sevinc Məmmədova, ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, rektor müşaviri Ümid Mehdiyev, ADPU-nun İkili diplom proqramının direktoru Tofiq Əhmədov və proqramın katibi Nərgiz Mehdiyeva iştirak edib. İclasda tərəflər ikili diplom proqramının nəticələrindən razılıqlarını ifadə edərək, qarşılıqlı əməkdaşlığın perspektivlərini müzakirə ediblər. Yekunda Pedaqoji Universitetin rektoru, prof. Cəfər Cəfərov və CVU-nun dekanı Maykl Foyer ADPU və Corc Vaşinqton Universiteti arasında qarşılıqlı əməkdaşlığın davam etdirilməsi haqqında Niyyət Bəyannaməsi imzalayıblar.



## "#CodeForFuture" layihəsinin bağlanışı və mükafatlandırma mərasimi keçirilib



İyunun 27-də Pedaqoji Universitetdə "#CodeForFuture" layihəsinin bağlanışı və mükafatlandırma mərasimi keçirilib.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov, "Code For Future" layihəsinin rəhbəri Nazrin Əliyeva və ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva layihənin növbəti məzunlarına uğurlar arzulayıb, onların ümumitəhsil orta məktəblərində rəqəmsal bacarıqların tədrisi prosesinə verəcəkləri töhfələri qeyd ediblər.

Rektor Cəfər Cəfərov qeyd edib ki, ADPU olaraq gələcəyin müəllimlərində bu vərdişlərin formalaşması əsas məqsədlərimizdən biridir. Bununla bağlı ADPU-nun Riyaziyyat fakültəsi bir çox uğurlu layihələrə imza atmışdır. Elm və Təhsil Nazirliyi və "Algoritmika" şirkəti ilə birlikdə təşkil edilmiş "Rəqəmsal bacarıqlar" layihəsi bunlardan biridir.

Vurğulanıb ki, hazırda Bakı şəhəri və 53 regionda 500-dən çox orta ümumtəhsil müəssisəsində "İnformatika" fənni əvəzinə "Rəqəmsal bacarıqlar" tədris edilir. Bunu nəzərə alaraq 2020-ci ildən tədris planımıza "İnformatika müəllimliyi" və "Riyaziyyat və informatika müəllimliyi" ixtisaslarının əsas blokunda "Proqramlaşdırma dilləri 1", seçmə blokunda isə "Rəqəmsal bacarıqlar" fənləri yer almaqdadır. Təlim prosesi onlayn platforma üzərində tapşırıqların icrası və layihələrin hazırlanması üzrə aparılır. Filiallar da bu kimi layihələrdən kənarda qalmır. Belə ki, 2023-2024-cü tədris ilinin yaz semestrində ADPU-nun bölgələr üzrə filiallarında (Ağcabədi, Şamaxı, Şəki) "Proqramlaşdırma dilləri 1" fənni, Quba filialında isə hər iki fənn ("Proqramlaşdırma dilləri 1", "Rəqəmsal bacarıqlar") tədris olunmuşdur.

"Code For Future" layihəsinin rəhbəri Nazrin Əliyeva diqqətə çatdırıb ki, 2023-2024-cü tədris ilinin yaz semestrində Riyaziyyat fakültəsinin "İnformatika müəllimliyi" ixtisasının son kursunda təhsil alan 107 tələbə "Metodika" və "MİQ-ə hazırlıq", Riyaziyyat və informatika müəllimliyi ixtisasının sonuncu kursunda təhsil alan 112 tələbə isə "Rəqəmsal bacarıqlar" və "MİQ-yə hazırlıq" kurslarında (ümumi 219 tələbə) iştirak ediblər ki, onlardan da 211 nəfəri kursu müvəffəqiyyətlə başa vurub. Eyni zamanda layihə müddətində ADPU-nun 45 nəfər müəlliminə "Proqramlaşdırma dilləri: Python proqramı" modulu üzrə 20 saatlıq təlimlər keçirilib.

Daha sonra layihə məzunları çıxış edərək öz təəssüratlarını bölüşüb və layihənin məzunlarına sertifikatlar təqdim edilib.

## ADPU-da Məzun günü keçirildi





İyunun 28-də ADPU-da Məzun günü keçirilib. Məzun günündə Pedaqoji Universitet rəhbərliyi, məzunlar və tələbələr, eləcə də onların ailə üzvləri iştirak ediblər.

Mərasimin rəsmi hissəsində çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov məzun olan tələbələrə üzünü tutaraq Azərbaycanımızın fədakar gəncliyinin nümayəndələri kimi gələcəyimiz olan şagirdlərin təlim-tərbiyəsi ilə məşğul olmaq, eləcə də elmi-yaradıcı fəaliyyətə başlamaq üçün bu gün müstəqil addımlarını atmaları, bu şərəfli missiyaya başlamaları münasibəti ilə onları təbrik edib, uğurlar arzulayıb.

Rektor qeyd edib ki, çağdaş dünyamızda müəllimin əsas keyfiyyəti dəyişilmə və yüksək uyğunlaşma qabiliyyətidir. Buna görə də, ixtisas bilikləri ilə yanaşı, milli kimliyə, peşəkar və daimi inkişaf etdirilən davranış səriştələrinə, rəqəmsal və xarici dil bacarıqlarına malik olmaq gənc mütəxəssislərin əsas silahlarıdır.

Daha sonra təhsil aldıqları dövrdə yüksək akademik göstəriciləri, eləcə də sosial-ictimai fəaliyyəti ilə fərqlənən məzunlar Pedaqoji Universitet rəhbərliyi adından Fəxri Fərmanla təltif edilib.

Ardınca mərasim konsert proqramı ilə davam etdirilib. Gənclərin sevimli ifaçılarının təqdimatında səslənən bir-birindən maraqlı ifalar tələbələr tərəfindən böyük coşğu ilə qarşılanıb.

Qeyd edək ki, hazırda ADPU-da Azərbaycan, rus və ingilis bölmələri üzrə tədris aparılır, hər il prioritet sahələr üzrə yeni ixtisaslara qəbul aparılır, Universitetin qəbul planı son illər 100 faiz dolur. Cari tədris ilində ADPU-da qəbul aparılan bakalavr ixtisaslarının sayı 25-ə, magistr ixtisaslaşmalarının sayı isə 30-a çatıb. Son illərdə ADPU-nu seçən abituriyentlər arasında 500 və 600 baldan yüksək nəticə göstərənlərin sayında kifayət qədər artım müşahidə olunur.

Bu il Pedaqoji Universitetdən filiallar və Pedaqoji Kolleclə birgə ümumilikdə 4700 nəfərdən çox tələbənin məzun olması nəzərdə tutulur.

## BAŞSAĞLIĞI

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin rəhbərliyi və professor-müəllim heyəti adından mərhum əməkdaşımız və magistrantımızın yaxınlarına dərin hüznlə başsağlığı verirlik!**
**Allah rəhmət eləsin!**



**Şahrza Ağayev**
**İbtidai təhsilin pedaqogikası kafedrasının dosenti**



**Samir Haqverdiyev**
**II tədris ilinin magistrantı**



Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 1561

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.